Jurnal 25.04.2007-ci ildə
Azərbaycan Respublikası
Ədliyyə Nazirliyi
Mətbu nəşrlərin
reyestrinə daxil edilmişdir.
Reyestr № 2212

---

The journal is included in the
register of Press editions of the
Ministry of Justice
of the Republic of Azerbaijan on
25.04.2007.
Registration № 2212




Azərbaycan Mətbuat Şurası
MŞ
Azerbaijan Press Council

---

**Redaksiyanın ünvanı**
AZ1073, Bakı şəh.,
Mətbuat prospekti 529,
"Azərbaycan" nəşriyyatı,
6-cı mərtəbə

**Editorial address**
AZ1073, Baku,
Matbuat Avenue 529,
"Azerbaijan" Publishing House,
6-th floor

**Tel.:** + 994 50 209 59 68
+ 994 55 209 59 68
+ 994 99 809 67 68
+ 994 12 510 63 99

**e-mail**
elmmerkezi@aem.az

## Beynəlxalq indekslər / International Indices

ISSN: 2663-4619
e-ISSN: 2708-986X
DOI: 10.36719





























Scilit


WorldCat


























idealonline

ORCID

## TƏBİƏT ELMLƏRİ



## RİYAZİYYAT VƏ MEXANİKA

## TEXNİKA ELMLƏRİ

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR

## HUMANITIES AND SOCIAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/103/9-14

**Yeganə Məmmədova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
yeganememmedova.doc@gmail.com

# MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ MÜTƏHƏRRİK OYUNLAR VƏ YAŞ QRUPLARINDA ONLARIN TƏŞKİLİ

**Xülasə**

Uşaqların hərtərəfli normal inkişafında mütəhərrik oyunların çox böyük əhəmiyyəti vardır. Buna görə də fiziki tərbiyə məşğələlərinin hamısına mütəhərrik oyunlar daxil edilməlidir. Xüsusən məktəbəqədər yaş dövründə oyun uşağı daha çox cəlb edir, onun əsas məşğuliyyəti olur. Oyun bu dövrdə tərbiyənin başlıca vasitəsidir. Oyun uşaqlara kollektivdə özünü necə aparmaq qaydasını öyrədir, öz şəxsi mənafeyini ümumi mənafeyə tabe etdirmək vərdişi aşılayır. Oyunlar uşaqlarda dərketmə qabiliyyətini yüksəldir, onları gündəlik əlaqədə olduğu canlılarla tanış edir. Oyun həmçinin tərbiyə vasitəsi olub, nitqin, zehnin inkişafına kömək edir, təşəbbüskarlığı yüksəldir, gümrah və çevik olmağa təsir göstərir. Mütəhərrik oyunların tədrisi prosesində uşaqlar bir çox fiziki hərəkətlər icra edirlər. Bu oyunlar uşaqlara şən əhvali-ruhiyyə, gümrahlıq və sevinc gətirir, onlarda çəldlik, qorxmazlıq, yaradıcılıq kimi keyfiyyətlər aşılayır.

Mütəhərrik oyunların xüsusiyyətlərinə görə, onlardan məşğələnin hazırlıq, əsas və tamamlayıcı hissələrində istifadə etmək olar. Fiziki tərbiyə məşğələsinin birinci hissəsinin məqsədi uşaqların orqanizmini ikinci hissə üçün hazırlamaqdır. Uşaqlarda məşğələyə maraq və həvəs oyatmaq əsas məsələlərdən biridir. Bu hissə üçün elə oyunlar seçib tətbiq etmək lazımdır ki, uşaqlarda yüksək əhvali-ruhiyyə və məşğələyə maraq oyansın.

***Açar sözlər:*** *uşaq bağçaları, kiçik, orta, böyük yaş qrupu, mütəhərrik oyunlar, məşğələlər, fiziki hərəkətlər*

**Yegana Mammadova**
Azerbaijan State Pedagogical University
Doctor of Philosophy in Pedagogy
yeganememmedova.doc@gmail.com

## Dynamic games in pre-school educational institutions and their organization in age groups

**Abstract**

Dynamic games are very important in the all-round normal development of children. Therefore, dynamic games should be included in all physical education exercises. Especially in the pre-school age, the game attracts the child more, it becomes his main occupation. The game is the main means of education in this period. The game teaches children how to behave in a team, inculcates the habit of subordinating their personal interests to the common good. Games increase children's understanding and introduce them to the creatures they interact with on a daily basis. The game is also a means of education, it helps in the development of speech and mind, it increases initiative, it has an effect on being cheerful and flexible. In the process of learning dynamic games, children perform many physical actions. These games bring cheerful mood, fun and joy to children, instill in them qualities such as quickness, fearlessness, and creativity.

Due to the characteristics of dynamic games, they can be used in the preparatory, main and supplementary parts of the training. The purpose of the first part of physical training is to prepare children's bodies for the second part. One of the main issues is to arouse children's interest and passion for exercise. For this part, it is necessary to choose and apply such games as to arouse children's high mood and interest in the exercise.

***Keywords:*** *kindergartens, small, medium, large age groups, timeless games, trainings, physical activities*

## Giriş

Məktəbəqədər yaşlı uşaqların hərtərəfli inkişafında oyunların böyük rolu vardır. Xüsusən məktəbəqədər yaş dövründə oyun uşağı daha çox cəlb edir, onun əsas məşğuliyyəti olur. Oyun bu dövrdə tərbiyənin başlıca vasitəsidir. Birinci növbədə, oyun uşaqların əqli tərbiyəsini inkişaf etdirir, ətraf aləm haqqında təsəvvür və anlayışlarını təkmilləşdirir, dürüstləşdirir və bunun əsasında əqli qabiliyyətləri formalaşır. Uşaq oynayarkən materialın rəngini, formasını, xassələrini, məkan münasibətlərini, kəmiyyətini öyrənir, bitkilər və heyvanlar haqqında müəyyən təsəvvürlər əldə edir. Oyun uşaqlıq illərinin yol göstəricisidir. Bu prosesdə onlar öz təəssüratlarını daha çox ifadə etməyə çalışırlar. Oyun uşağın fiziki inkişafında, həyatı dərk etməsində mühüm rol oynadığı kimi, psixoloji inkişafında da özünəməxsus əhəmiyyət kəsb edir. Uşaqda oyun zamanı fəaliyyət, iradi səy formalaşır. Məqsədə müstəqil surətdə nail olmaq, qarşıya çıxan çətinlikləri aradan qaldırmaq uşaq oyununun başlıca məqsədini təşkil edir. K. D. Uşinski uşağın oyun fəaliyyəti haqqında belə qeyd etmişdir ki, "əsl həyatda uşaq hələ heç bir müstəqilliyə malik olmayan, həyat axını tərəfindən qayğısız və kortəbii şəkildə cəlb edilən bir məxluqdur. Oyunda isə uşaq yetişən adam olub öz gücünü sınayır, özünün quraşdırdığı şeylər üzərində müstəqil olaraq hakimlik edir" (Həsənov, 2009: 146).

Oyun uşağın aparıcı fəaliyyətidir. Oyunda o, bir şəxs kimi inkişaf edir, sosial praktikasının uğurunun sonradan asılı olacağı psixikanın aspektlərini formalaşdırır. Oyun uşaqların sosial sınaqları, yəni uşaqların özünü yoxlamaq üçün seçdiyi və oyun zamanı yaranan şəxsiyyətlərarası münasibətlər problemlərinin həlli yollarını mənimsədikləri testlər üçün sınaq meydançasıdır. Oyun yeni aparıcı fəaliyyət üçün zəmin yaradır. Buna görə də pedaqoji təcrübənin ən vacib vəzifəsi məktəbəqədər yaşlı uşağın oyun fəaliyyətinin aktivləşdirilməsi, genişləndirilməsi və zənginləşdirilməsi üçün məktəbəqədər təhsil müəssisəsində xüsusi yerin optimallaşdırılması və təşkilidir. Uşaqlara asanlıqla verilən yeganə dil oyun dilidir. Bu, yaşla bağlı yaranan problemləri və münasibətlərdəki çətinlikləri düzəltməyə imkan verən oyundur. Oyunsuz uşağın həyatı mümkün deyil! (Ağayev, 1989: 18).

Oyun fəaliyyəti davranış özbaşınalığının və bütün psixi proseslərin formalaşmasına təsir göstərir – elementardan ən mürəkkəbə qədər. Oyun rolunu yerinə yetirərkən uşaq bütün anlıq impulsiv hərəkətlərini bu vəzifəyə tabe edir. Oyun şəraitində uşaqlar böyüklərin birbaşa göstərişlərindən daha yaxşı konsentrə olurlar və xatırlayırlar. Oyunların bir çoxu xəyali olduğundan və yaradıcı gücü məcbur etdiyindən, bəzən texnologiya və ideologiya baxımından cəmiyyətin vəziyyətindən daha qabaqcıl düşüncələr daşıyır. Beləliklə, onu kəşfiyyat və tərəqqinin başlanğıc nöqtəsi hesab etmək olar.

Mütəhərrik oyunlar hazır məzmuna malik olur və ciddi ardıcıllıqla oynanılır. Bu oyunlarda uşaqların qarşısında müəyyən hərəkətlər – topu tutmaq, yoldaşına çatmaq, ritmik hərəkətlər və s. təkrar etməyi tələb edən vəzifələr qoyulur. Eyni zamanda həmin hərəkətlərlə əlaqədar sözlər, ifadələr onların nitqinə daxil olur. Mütəhərrik oyunlar təbiətin qoynunda keçirildiyindən uşaqlar ətraf aləmlə tanış olur, təsəvvürlərini, nitqlərini zənginləşdirirlər. Bu oyunlarda nitq və düşüncə inkişaf etdirilir.

Mütəhərrik oyunlar vəziyyət və şəraitdən asılı olaraq adamın vəziyyətdən tezliklə çıxmasına kömək göstərir, cəldliyi, çevikliyi, sürəti inkişaf etdirir, fiziki cəhətdən təkmilləşməyə zəmin yaradır. Oyun uşaqlara kollektivdə özünü necə aparmaq qaydasını öyrədir, öz şəxsi mənafeyini ümumi mənafeyə tabe etdirmək vərdişi aşılayır. O, həm də iradəli, hünərli olmağı tərbiyə edir,

düzgün və müstəqil hərəkət etməni öyrədir. Oyunlar uşaqlarda dərketmə qabiliyyətini yüksəldir, onların gündəlik əlaqədə olduğu canlılarla tanış edir. Oyun həm də tərbiyə vasitəsi olub, nitqin, zehnin inkişafına kömək edir, təşəbbüskarlığı yüksəldir, gümrah və çevik olmağa təsir göstərir (3).

Oyunları təxminən 3 müstəqil növə ayırmaq olar:

1) mütəhərrik oyunlar: əsas və elementar mütəhərrik oyunlar (süjetli və süjetsiz),

2) idman xarakterli oyunlar (basketbol, voleybol, futbol, stolüstü tennis, badminton və s.),

3) mahnı oxumaqla və əl-ələ tutub dairə təşkil etməklə oyunlar (Qədirov, 2002: 32).

**Elementar mütəhərrik oyunlar**

Uşaq bağçasında elementar mütəhərrik oyunlar xarakterikdir. Bunlar süjetli və süjetsiz olurlar. *Süjetli mütəhərrik oyunların* adından məlum olduğu kimi, müvafiq süjeti və ciddi qayda-qanunu olur. Bu oyunlar müasir həyatla əlaqədar uşaqlarda müəyyən təsəvvürlər yaradır. Onlar müvafiq rolları yerinə yetirirlər. Oyun qaydaları uşaqlara nəyi etmək olar və nəyi etmək olmazı müəyyən etməklə onun mahiyyətinə də aydınlıq gətirir.

*Süjetsiz oyunlar* hər hansı bir hərəkət üzrə tapşırıqların icrasına əsaslanaraq qurulur. Bu oyunlar müxtəlif əşyalarla keçirilir (top, halqalar, çubuqlar və s.). Əşyalarla oyunun keçirilməsi uşaqların marağını yüksəldir, idman fəallığını artırır (“Bayrağa qədər qaç”, “Halqalardan keç” və s.).

**Mütəhərrik oyunlar**

Mütəhərrik oyunlar bir çox cəhətlərinə, yəni xarakter və məzmununa, daşıdığı məqsəd və vəzifələrə görə digər oyunlardan mühüm dərəcədə fərqlənirlər. Mütəhərrik oyunlar, ilk növbədə, ciddi və məsuliyyətli, dəqiq hazırlıq işləri o qədər də tələb etmir. Onun təşkili və keçirilməsi üçün sanballı təqvim-tematik planlarına onların yerinə-yetirilməsinə ciddi riayət ediləcəyinə, geniş və hərtərəfli təbliğatı, təşkilati tədbirlərin görülməsinə əhəmiyyətli dərəcədə ehtiyac yoxdur. Hər bir oyun alət və avadanlıqlardan, oyun ləvazimatlarından, idman bazasından və keçiriləcək şəraitdən asılı olaraq təşkil olunmalı, həyata keçirilməlidir. Burada regionun iqlim şəraiti də nəzərə alınmalı, iqlim dəyişikliyinə müvafiq olaraq hazırlıq işləri də görülməlidir. Oyunun lazımi səviyyədə təşkili, keçirilməsi və məqsədəuyğun nəticəsinin əldə olunması da mühüm komponentlərdən sayılır.

Mütəhərrik oyunları həraki fəaliyyətə görə qruplara bölmək mümkündür. Məsələn, qaçışla, dırmanma ilə oyunlar, tullanma və tullanmalarla oyunlar. Mütəhərrik oyunlar böyük, orta və kiçik mütəhərrikliyinə görə dərəcələrə bölünür. Onlar böyük, orta və kiçik mütəhərrikliyinə görə bir-birindən də fərqlənirlər. Yüksək mütəhərrikli oyunlarda bütün uşaqlar iştirak edir. Burada əsasən qaçış və hoppanmalara mühüm yer verilir (Quliyev, 2011: 189).

Orta mütəhərrik oyunlarda da bütün uşaqlar iştirak edir. Lakin mütəhərrik oyunun mütəhərrikliyi nisbətən sakit olur. Belə oyunlar yeriş, topun ötürülməsi kimi hərəkətlərlə xarakterikdir. Az mütəhərrik oyunlarda isə uşaqlar hərəkəti yavaş tempdə və az intensiv şəkildə yerinə yetirməlidirlər.

Uşaqların hərtərəfli normal inkişafında mütəhərrik oyunların çox böyük əhəmiyyəti vardır. Buna görə də fiziki tərbiyə məşğələlərinin hamısına mütəhərrik oyunlar daxil edilməlidir. Mütəhərrik oyunların tədrisi prosesində uşaqlar bir çox fiziki hərəkətləri icra edirlər. Bu oyunlar uşaqlara şən əhvali-ruhiyyə, gümrahlıq və sevinc gətirir, onlarda çəldlik, qorxmazlıq, yaradıcılıq kimi keyfiyyətlər aşılayır. Uşaqlar bəzi fiziki hərəkətləri oyun zamanı daha yaxşı öyrənirlər (Mursaqulova, 2012: 212).

Əgər uşaqlar hər hansı hərəkəti düzgün icra edə bilmirsə, tərbiyəçi izahat verərək həmin hərəkəti bir daha təkrar etməlidir. Beləliklə, uşaqlar həm oyunu oynayır, həm də hərəkətləri öyrənirlər. Ən əsası odur ki, oyun zamanı uşaqlarda həraki keyfiyyətlərin inkişafına diqqət artırılsın. Ona görə də qarşıya qoyulmuş məqsədi nəzərə alaraq tərbiyəçi elə oyunlar seçməlidir ki, oyun prosesində bütün uşaqlar eyni vaxtda intensiv fəaliyyətdə olsunlar. Daha yaxşı olar ki, uşaqlara tanış oyun verilsin. Əgər oyun uşaqlara tanışdırsa, tərbiyəçi oyunun izahına az vaxt sərf edir.

Mütəhərrik oyunların xüsusiyyətlərinə görə, onlardan məşğələnin hazırlıq, əsas və tamamlayıcı hissələrində istifadə etmək olar. Fiziki tərbiyə məşğələsinin birinci hissəsinin məqsədi uşaqların orqanizmini ikinci hissə üçün hazırlamaqdır. Uşaqlarda məşğələyə maraq və həvəs oyatmaq əsas məsələlərdən biridir. Bu hissə üçün elə oyunlar seçib tətbiq etmək lazımdır ki, uşaqlarda yüksək

əhvali-ruhiyyə və məşğələyə maraq oyansın. Əsas hissədə tərbiyəçi qarşıya qoyduğu məqsədəuyğun oyunlar seçib verməlidir. Çünki fiziki tərbiyənin qarşısında duran əsas məqsəd bu hissədə həyata keçirilir. Üçüncü, yəni tamamlayıcı hissədə məşğələyə yekun vurulur. Bu hissənin məqsədi uşaqların əvvəlki hissələrdə aldıqları fiziki yükü nəzərə alaraq onların orqanizmini nisbətən əvvəlki vəziyyətə qaytarmaqdır. Ona gorə də bu hissədə tənəffüs və əzələlərə boşaldıcı hərəkətlər vermək lazımdır. Tərbiyəçi elə oyunlar verməlidir ki, uşaqların yorğunluğunu aradan qaldırsın və onlar məşğələdən sonra özlərini gümrah və şən hiss etsinlər. Eyni zamanda oyunlarda müəyyən nəticələrə nail olmaq məqsədilə təlimin müvafiq prinsiplərindən istifadə olunur.

1. Oyun təlimində ideyalılıq və elmililik prinsipləri.
2. Şüurluluq və fəallıq prinsipi.
3. Ardıcıllıq prinsipi.
4. Oyun təlimində müvafiqlik prinsipi.
5. Oyun təlimində fərdi yanaşma prinsipi.
6. Oyun təlimi prinsiplərindən vəhdətdə istifadə olunması (7).

Birinci kiçik yaş qrupu ilə gəzinti zamanı mütəhərrik oyunların gündə iki dəfə – səhər və axşamüstü gəzintiləri zamanı keçirilməsi məsləhət görülür. Mütəhərrik oyunların gəzinti zamanı keçirilmə müddəti həmin gün fiziki məşğələnin olub olmamasından asılıdır. Əgər həmin gün fiziki tərbiyə məşğələsi varsa, onların davamiyyət müddəti 6-8 dəqiqə olmalıdır. Ona gorə ki verilmiş fiziki yük normanı keçməməlidir. Əgər fiziki tərbiyə məğələsi yoxdursa, mütəhərrik oyunların davamiyyət müddətini 10-12 dəqiqəyədək artırmaq olar.

İki-üç yaşlı uşaqları hərəkətli oyunlara cəlb edən hərəkət prosesinin özüdür. Qaçmaq, ötmək, tullanmaq, axtarmaq çox maraqlıdır, lakin onlar üçün bu hərəkətlərin nəticəsinin əhəmiyyəti yoxdur. Ona görə də kiçik yaşlı uşaqlara çox vaxt bir hərəkət əsasında qurulmuş ən sadə oyunların verilməsi məsləhət görülür. Bu hərəkətləri də tərbiyəçi oyun zaman uşaqlara izah edir. O, səbətdəki topları diyirlədərək: “Baxın, bu qəşəng toplar necə diyirlənir, onları tutun” və ya “Məni tutun”, – deyib özü qaçır, uşaqlar da onun dalınca qaçışırlar (8).

Oyunda aparıcı rolu varsa, buna dayə və böyük yaşlı uşaqlar cəlb edilməlidir. Uşaqlar hərəkətləri mənimsədikdə və onu müstəqil yerinə yetirdikdə tərbiyəçi aparıcı rolunu icra edə bilər. Uşaqlar tərbiyəçinin sözü və işarəsi ilə hərəkət etməyi öyrəndikdə oyunun qaydası tətbiq edilir. Əvvəlcə tamamilə sadə oyunlar verilməlidir. “Mən nə vaxt “qaçın” desəm, siz qaçıb stullarınızda oturun” və ya “Pişik miyoldayan kimi, bütün siçanlar yuvalarında gizlənsinlər”.

İkinci kiçik yaş qrupunda mütəhərrik oyunlar və fiziki hərəkətlər həftənin müxtəlif günlərində aparılmalıdır. Eyni zamanda mütəhərrik oyunların, fiziki hərəkətlərin sayı və keçirilmə müddəti də eyni olmalıdır. Bu yaş qrupunda aparıcı rolunu ayrı-ayrı uşaqlara tapşırmaq olar. İl müddətində bütün uşaqlar növbə ilə bu rolu ifa etməlidirlər.

Oyunu əvvəlcə bir neçə uşaqla başlamaq lazımdır. Onlar bir-birinə mane olmadan otağın (meydançanın) hər tərəfinə qaçmağı öyrəndikdə oyunu bütün qrup uşaqları ilə aparmaq olar. Kiçiklər üçün oyunda verilmiş oyuncağın, obrazların emosional qavranılması xarakterikdir. Ona görə də uşaqlara sərbəst yeriməyi, asan qaçmağı və hoppanmağı öyrətmək məqsədilə tərbiyəçi onların bu xüsusiyyətlərinə istinad edir: “Pəncə üstdə yavaş-yavaş qaçaq ki, pişik oyanmasın” – deyir.

Uşaqlar çox məmnuniyyətlə bu obrazı təqlid edərək siçanlar kimi qaçır, sərçə və ya dovşan kimi hoppanırlar. Bu yaş qrupu ilə mütəhərrik oyunlar keçirərkən uşaqlardan oyunun bütün qaydalarına dəqiq əməl etmələrini tələb etmək lazımdır. Artıq bu yaşda uşaqlar sırada öz yerində dayanmağı bacarmalıdırlar. Uşaqlardan tələb etmək lazımdır ki, oyun müddətində əvvəlcədən müəyyənləşmiş yeri tutsunlar və oyun qurtaranda göstərişsiz öz yerlərinə qayıtsınlar (Babayev, 2001: 23).

Orta yaş qrupunda hər gün gündə iki dəfə – günün birinci və ikinci yarısında mütəhərrik oyunlar təşkil edilib keçirilir. Hansı gün fiziki tərbiyə məşğələsi yoxdursa, 20-25 dəqiqə, qalan günlərdə isə 8-10 dəqiqə ərzində mütəhərrik oyunları təşkil edib keçirtmək olar. Bu yaş qrupunda oyunlar nisbətən çətinləşdirilir. Hərəkətlərin məhdudlaşdırılması oyuna daxil edilir. Ancaq toxunanı tut,

tutulanlar kənara çıxır. Bu dövrdə oyun qaydasına dəqiq riayət olunmasına tərbiyəçi mütləq nail olmalıdır.

Mütəhərrik oyunlarla yanaşı, artıq böyük yaş qrupunda aparılan məşğələlərə idman oyunları da daxil edilməlidir. Orta və böyük qruplarda tərbiyəçi uşaqlara hansı oyunu oynayacaqlarını, kimin nə edəcəyini söyləyir, sonra isə rolları bölüşdürür. Beş yaşlı uşaqlar olan qrupda tərbiyəçi onların fəallıq dərəcəsini, tez qaçmaq, dırmanmaq bacarığını nəzərə alaraq kimin nə edəcəyini özü təyin edir. Aparıcı rolunu əvvəlcə uşaqlara vermək lazımdır ki, onun öhdəsindən gələ bilsinlər. Əks təqdirdə, uşaq öz qüvvəsinə inanmaz, sonra onu fəal işə cəlb etmək çətin olar (Abbasov, 1966: 11).

Məktəbəhazırlıq qrupunda elə oyunlar təşkil edilir ki, həmin oyun prosesində uşaqlar sahəyə tez bələd olur, dözümlülük, cəldlik və səbatlılıq göstərirlər. Bu oyunlar yarış elementlərinə, cəld hərəkətlərə görə hissələrə ayrılmışdır. Buna "Bayrağı dəyişdir", "Lenti kim tez götürər", "Kim tez çıxar" və s. oyunlar daxildir.

Həmin qrupda tərbiyəçi əvvəlki qrupda olduğu kimi, bütün qrup uşaqları ilə ayrı-ayrı kiçik qruplarla oyun təşkil edir. Uşaq həyatında hərəkətli oyunların lazımi qədər yer tutması üçün tərbiyəçi özü həmin oyunları yaxşı bilməli, uşaqlarla məmnuniyyətlə oynamalıdır. Əgər tərbiyəçi özü topu atıb-tuta bilmirsə, uşaqlarda bu tip oyunlara maraq oyatmaq çətin olacaqdır. Əksinə, tərbiyəçinin bir dəfə vurmaqla keqliləri yıxması ilə uşaqlar fəxr edirlər.

## Nəticə

Hər yaş qruplarında, istər bütün qrupla, istrəsə də kiçik qruplarla tərbiyəçi tərəfindən təşkil olunan oyunlar uşaqlar üçün maraqlı olmalı, canlı və emosional keçirilməlidir. Yalnız bu tələblərə uyğun keçirilən oyunlar təsirli bir tərbiyə vasitəsi ola bilər.

Uşaqların hərtərəfli fiziki inkişafında idman oyunlarının rolu çox böyükdür. Fiziki tərbiyə məşğələlərində şəhərcik, baksetbol, badminton, futbol və s. idman oyunlarının ən sadə elementlərindən birindən də istifadə etmək olar. Tərbiyəçi hər gün səhərlər və gündüz yuxusundan sonra gəzinti zamanı mütəhərrik oyunlar və fiziki hərəkətlər verməlidir. Fiziki tərbiyə məşğələsi olmayan günlər səhər gəzintisi zamanı mütəhərrik oyunlara və fiziki hərəkətlərə 25-30 dəqiqə vaxt ayırmaq lazımdır. Fiziki tərbiyə məşğələsi olan günlərdə isə bu işə 10-12 dəqiqə vaxt sərf etmək olar. Axşam gəzintisi zamanı təşkil edilmiş mütəhərrik oyunlar və fiziki hərəkətlər üçün 10-15 dəqiqə kifayətdir (Məmmədova, 2018: 67).

Fiziki tərbiyə sistemində mütəhərrik oyunların sağlamlıq əhəmiyyəti daha böyükdür. Çünki oyunda fəal iştirak edən hər bir uşaq orqanizmi üçün istənilən qədər müxtəlif hərəkət alır. Oyun zamanı orqanizm təkcə fiziki yükün deyil, həm də təbii amillərin: günəşin, suyun, havanın təsirinə də müsbət mənada məruz qalır. Lakin bütün bunlar o zaman yaxşı təsir göstərir ki, oyunun keçirilməsi üçün lazımi şərtlərə əməl edilmiş olsun.

Mütəhərrik oyunlar yalnız fiziki inkişafı deyil, bir çox mühüm pedaqoji-psixoloji məsələləri də həll edir. Oyunlar vasitəsilə diqqət, yaddaş, görmə, eşitmə, qavrayış, təxəyyül və s. məşq olunur, inkişaf etdirilir. Oyunlar diqqətin, yaddaşın, görmə, eşitmə və qavrayışın inkişafını sürətləndirir, təkmilləşdirir və nəticə etibarilə möhkəmləndirir.

"Uşaqlıq – oyun dövrüdür", – deyirlər. Ona görə də uşağın tərbiyə olunması prosesini oyunlardan kənarda təsəvvür etmək olmaz. Bu dövrdə oyun prosesi fiziki tərbiyədə universal xarakter daşıyır.

Məktəbəqədər tərbiyə müəssisələrində oyunlardan istifadə etməklə təlim-tərbiyə müəssisələrinin tam bir kompleksi həll olunur. Lakin bu zaman elmi-pedaqoji əsaslara istinad edilmədən məqsədə nail olmaq olmaz. Oyunlardan təkcə oynamaq naminə, yaxud uşaqların istək və arzularına əməl edib oyun seçmək tamamilə yanlış fikirdir. Çünki bədən tərbiyəsi və idmanın tətbiq olunmasında riayət olunan "asandan çətinə" pedaqoji prinsipinə riayət olunduğu kimi, mütəhərrik oyunların da seçilməsində və tətbiq olunmasında pedaqoji, psixoloji, fizioloji və nəhayət, idman prinsiplərinə riayət olunmalıdır. Bu, hər bir məktəbəqədər müəssisələrdə işləyən tərbiyəçilərdən konkret prinsipiallıq və bacarıq tələb edir. Eyni zamanda məktəbəqədər tərbiyə müəssisəsinin müdiri və metodisti də məsuliyyət daşıyır (Nəzərov, 2011: 56).

Mütəhərrik oyunlar uşaqların davranışına, həyat hadisələrinə müəyyən münasibəti tərbiyə edən, onların hərtərəfli inkişafına cavab verən fəaliyyət növüdür. Belə mühüm fəaliyyəti düzgün yönəltmək və bir üsul kimi pedaqoji təcrübədə nitq inkişafı üçün istifadə etmək biz tərbiyəçilərin məharətindən asılıdır. Təcrübə onu göstərir ki, istər bağçada aparılan təlim-tərbiyə işi, istərsə də ailə və bütün ətraf mühit uşağa təsir edir. Tərbiyəçilər və ailə tərəfindən uşağa müvafiq şərait yaradılarsa, alınan təəssüratlar oyunlarda öz əksini tapar. Bu isə, həqiqətən, uşağın hərtərəfli inkişaf etməsinə, xarakterinin formalaşmasına, xüsusən nitqinin inkişafına təsir edə bilər.

## Ədəbiyyat

1. Həsənov, A. M. (2009). Məktəbəqədər pedaqogika. Bakı: Nasir, 374 s.
2. Ağayev, H. H. (1989). Azərbaycan uşaq mütəhərrik oyunları. Bakı: Maarif, 90 s.
3. Məktəbəqədər təhsilin yeni məzmunu və onun tətbiqi məsələləri. (2018). Bakı: Mütərcim, 183 s.
4. Qədirov, Ə. (2002). Yaş psixologiyası. Bakı: Maarif, 194 s.
5. Quliyev, B. (2011). Mütəhərrik və əyləncəli oyunlar. Bakı: ADPU, 493 s.
6. Mursaqulova, R. (2012). Məktəbəqədər pedaqogika. Bakı: ADPU, 432 s.
7. Məktəbəqədər müəssisələrdə tərbiyə və təlim proqramı. (1998). Bakı, 167 s.
8. Körpə yaşlı uşaqlar üçün oyun və məşğələlər. (1973). Bakı, 46 s.
9. Babayev, H. A., Qasımova, S. A. (2001). Uşaq bağçalarında mütəhərrik oyunlar. Bakı, 53 s.
10. Abbasov, T. T. (1966). Mütəhərrik oyunlar. Bakı: Azərnəşr, 61 s.
11. Məmmədova, A. T. (2018). Məktəbəqədər yaşlı uşaqların oyunları. Sumqayıt: Avropa, 201 s.
12. Nəzərov, A. M. (2011). Məktəbəqədər pedaqogika. Bakı, 185 s.

Göndərilib: 23.04.2024 Qəbul edilib: 02.06.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/15-20

**Telli İbrahimova**
Bakı Slavyan Universiteti
filologiya üzrə fəlsəfə doktoru
69_cicek_69@rambler.ru
**İradə Zamanova**
Bakı Dövlət Universiteti
zirada04@gmail.com

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ DİSTANT TƏHSİLİN İDARƏOLUNMASINDA YENİ TƏKLİFLƏR

**Xülasə**

Məqalə distant təhsilin səmərəli idarəolunmasında bir sıra ədəbiyyat nümunələrində aparılan təhlilin nəticələrinə uyğun ən dəyərli təklifləri təqdim edir. Təkliflər toplusu müasir distant və hibrid dərslərinin təşkilində tətbiq oluna biləcək ən səmərəli yolları açıqlayır. Məqalənin məqsədi qeyd olunan təkliflər əsasında distant təhsilin təşkili prinsiplərini yaratmaq və tədris prosesində bu təkliflərin tətbiqi metodikasının əsasını şərh etməkdir. Məqalədə həmçinin Avropa Komissiyası tərəfindən hazırlanmış hibrid təhsilin tətbiqi standartları haqqında məlumatlar da öz əksini tapmışdır. Distant təhsilin pedaqoji-psixoloji üstünlüklərini əks etdirən virtual təhsilin elementləri geniş şərh edilmiş, yenilənmiş texnologiya, zamanın idarə olunması, virtual qarşılıqlı əlaqə, təşəbbüskarlıq, şəxsi özünü idarəetmə, düzgün cədvəl, şagird maraqları, diqqəti yayındırmaqdan çəkinmək, performans təhlili və real statik məqsədlər elementlər kimi açıqlanmışdır. Distant təhsilin pedaqoji-psixoloji üstünlüklərini əks etdirən virtual təhsilin elementlərinin qarşıya çıxan problemlərin həllində rolu izah edilmişdir.

***Açar sözlər:*** *hibrid təhsil standartları, virtual öyrənmə elementləri, təkliflər, distant təhsil, tədris prosesi*

**Telli Ibrahimova**
Baku Slavic University
Doctor of Philosophy in Philology
69_cicek_69@rambler.ru
**Irada Zamanova**
Baku State University
zirada04@gmail.com

## New proposalsin management of distance education in general education

**Abstract**

The paper offers the best recommendations based on the findings of an analysis of multiple literature samples on the effective administration of distance learning. The compilation of suggestions shows how to set up contemporary hybrid and remote learning environments most successfully. The article's goals are to formulate the guiding principles for distance learning institutions in light of the aforementioned suggestions and to explain the rationale behind the methodology used to implement these recommendations in the teaching and learning process. The article provides information on the application standards for hybrid education that were developed by the European Commission. The benefits of distance education are reflected in the elements of virtual education, which include updated technology, time management, virtual interaction, personal self-management, initiative, a correct schedule, student interests, avoiding distractions, performance analysis, and realistic goals. The article explains the role of these elements in solving problems and how they reflect the pedagogical and psychological advantages of distance education.

***Keywords:*** *hybrid education standards, virtual learning elements, proposals, distance education, teaching proces*

## Giriş

**Distant təlimin səmərəli idarəolunması üzrə təkliflərin hazırlanması**

Texnologiyanın inkişafı və təhsil sənayesinin təkamülü bütün dünyada distant təhsilin yaranmasına səbəb oldu. Əvvəllər onlayn təhsil metodları yalnız minimum sayda təhsil müəssisəsi tərəfindən istifadə olunurdusa, lakin pandemiyanın ortaya çıxması onu təhsil sektorunun təməl daşına çevirdi. Distant təhsil bütün dünyada trend olmağa başladı və təhsilin bu forması haqqında yeni təkliflərin hazırlanmasına ehtiyac duyuldu. Hazırlanan təkliflər bir çox institutlar tərərfindən distant rejimdə çoxsaylı kurslar və proqramlar təklif edir ki, bu da keyfiyyətli təhsili sinif hüdudlarından kənara çıxarmağın təsirli yolu olmuşdur. Son üç il ərzində Azərbaycanda 60-dan çox məktəb distant təhsildən istifadə edir. Müşahidələr göstərir ki, 75 % məktəbli artıq distant təhsilin üstünlüklərini anlayaraq onu müasir dövrün əlçatan bir üsulu hesab edir.

Distant təhsildə ən yeni təkliflərdən biri rəqəmsal proseslərin şaxələnməsidir. Bu təklif sübut edir ki, virtual təlim mühiti üçün lisenziyaların vacibliyi, rəqəmsal məzmuna keçid, uğurlu distant öyrənmə meyarlarının müəyyən edilməsi, distant öyrənmə prosesinin çətinlikləri, bəzi məhdudiyyətlər və hibrid təhsil haqqında Avropa Komissiyası müəyyən təlimatlar hazırlamışdır. Hibrid təhsilin tətbiqi haqqında standartlar 2021 – 2027-ci illər üçün Avropa Komissiyasının Rəqəmsal Təhsil Planında təhsilin keyfiyyəti və əlçatanlığının vacibliyini xüsusi qeyd etmişdir (İsmayılova, 2014; Basol, Balgalmis, 2016; Cakiroghlu, Erdoghdu, Kokoc, Atabay, 2017).

Buna baxmayaraq, ümumtəhsil məktəblərində virtual şəkildə həyata keçirilən distant təhsilin səmərəli formada həyata keçirilməsi sahəsində kifayət qədər problem və boşluqlar vardır. Bu hal onunla izah olunur ki, metodiki sahədə gözləntilər o qədər də ürəkaçan deyildir. Virtual dərslərin təşkili sahəsində müəllim və şagird balansı düzgün bölünməyib, vaxtın səmərəli təşkili, şagird cəlbi və virtual metodika sahəsində çətinliklər hələ də davam etməkdədir.

Digər verilən təkliflərdən biri də distant təhsildə virtual elementlərin kəşfidir. Distant təhsilin səmərəli idarəolunmasında ilk olaraq şagirdlərin virtual aləmə həvəslənməsi və məhsuldar təlimə cəlb olunmasıdır. Bunun üçün təklif olunan yollar bu məhsuldarlığı təmin etməkdə böyük rol oynayır.




**Şəkil 1. Virtual təhsilin elementləri**

Şəkildən göründüyü kimi, son ədəbiyyat nümunələrində təklif olunan virtual təhsilin elementləri bir-birini tamamlayan alqoritmik bir prosesdir.

*Yenilənmiş texnologiya.* Texnologiya distant təhsilin təməl daşıdır. Dərslərin rahat keçməsi üçün yenilənmiş brauzer və proqram versiyası, yaxşı internet bağlantısı və lazımi aparat cihazlarınızın olduğundan əmin olmalısınız. Bu, həm məhsuldarlığı təmin edəcək, həm də vaxtınıza qənaət etməyə kömək edəcək (Əlizadə, 2019; İsmayılova, 2014).

*Zamanın idarə olunması.* Distant təhsil sizə vaxtın idarə edilməsi bacarıqlarınızı artırmağa kömək edəcək. Siz dərslərinizi idarə etmək, tapşırıqlarınızı yerinə yetirmək, son tarixlərə cavab vermək və s. üçün düzgün cədvəl tərtib etməlisiniz. Cədvəl sizə mütəşəkkil olmağa kömək edəcək və beləliklə, işinizdə səmərəliliyinizi artıracaq (Chemsi, Sadiq, Radid, Talbi, 2020).

*Virtual qarşılıqlı əlaqə.* İnteraktiv təlim mühiti dərslərdə iştirak edən şagirdlərin mövzuya marağını, eləcə də fəallığını artırır. Onlar həm şəxsi, həm də peşəkar olaraq onlara faydalı olacaq təklifləri, ideyaları qəbul edib əlaqələr qura biləcəklər. Bu hal həm də sinifdə cansıxıcılığı azaldacaq. Düzgün qarşılıqlı əlaqə və ünsiyyət sizə yeni bacarıqlar öyrənməyə kömək edəcək.

*Təşəbbüskarlıq.* Şagirdlər virtual mühitdə mütəmadi olaraq öz müəllimləri ilə əlaqə qurmalı və onlardan rəy almaq yolu ilə öz performanslarını yaxşılaşdırmağa diqqət etməlidirlər. Onlar öz performanslarını artırmaq məqsədilə təşəbbüs edərək rəhbərlərinə müsbət təsir göstərməlidirlər (Garrison, 2000).

*Şəxsi özünə qulluq.* Dərslər boyu özlərini motivasiyalı və məhsuldar hiss etmək üçün şagirdlər sağlam olmalı və yaxşı istirahət etməlidirlər. Şagird xəstə halda dərs zamanı cansıxıcılıq hiss etməyə başlayacaq və dərsdən tez yorulacaq. Beləliklə, düzgün qidalanma, kifayət qədər yuxu və şəxsi qayğı dərslərdə iştirak etmək üçün səlahiyyətli olmaq üçün son dərəcə vacibdir (Holmberg, 1995).

*Düzgün cədvəl.* Məhsuldarlıq düzgün iş qrafikinin saxlanmasının birbaşa nəticəsidir. Düzgün dərs cədvəli daha yaxşı və daha səmərəli nəticələrə gətirib çıxaracaq və uşaqları çətinlikdən xilas edəcək. Beləliklə, onlar növbəti gün üçün motivasiya hiss edəcəklər.

*Şagird maraqları.* Distant təhsildə təkrarlanan dərs mövzuları və tapşırıqlar monotonluğa səbəb ola bilər. Bu zaman işin yorucu və ağır olduğunu hiss etmək olur. Tapşırığı yerinə yetirmək üçün tələb olunan əsas cəhət şagird marağıdır. Beləliklə, tənbəllikdən qaçmaq üçün uşaqları həmişə tapşırıqlara cəlb etməyə çalışmalısınız.

*Diqqəti yayındıran şeylərdən çəkindirmək.* Məlumdur ki, ev, uşaqları onlayn təlimdən yayındıran və müdaxilələrlə dolu bir yerdir. Beləliklə, bütün bunların qarşısını almaq olar. Məsələn, təhsil zamanı telefonunuzda lazımsız bildirişləri söndürmək, ümumi diqqəti yayındıran şeylərdən uzaq bir yer seçmək, bütün sosial media alətlərini uzaq tutmaq və s. Bu kiçik addımlar atmaqla məhsuldarlığı artıra və diqqəti yayındıran amilləri minimuma endirmək olar (Garrison, 2000).

*Performans təhlili.* Qarşıya məqsədlər qoymaq və onlara doğru irəliləmək, lakin mütəmadi olaraq performansınızı izləməli və əgər varsa, sapmaları tapmalısınız. Düzgün qiymətləndirmə daha çox səmərəliliyə və maksimum məhsuldarlığa səbəb olacaqdır. Üstəlik, daha da böyük nailiyyətlər əldə etmək üçün limitlərinizi zorlayacaqsınız.

*Realist tədqiqat məqsədləri.* Qeyri-real tədqiqat məqsədləri məyusluğa səbəb olur. Tələbələr demotivasiya hiss edirlər. Beləliklə, qısamüddətli əldə edilə bilən hədəflər, sadə və asan bir cədvəl təyin edilməlidir. Məqsədlərinizə nail olmaq, özünəinamı artırmaq daha müsbət nəticələrə gətirib çıxarır (Vyatkina, V'yugina, 2018; Iksanova, Khayrullina, Vyatkina, 2018).

İnternetin həyatımızda hökmranlığı ilə birlikdə distant təhsil çox məşhurlaşdı. Bu, biliklərin istənilən məsafəyə tez çatmasını təmin etdiyi üçün təhsildə əsaslı inkişafdır. Lakin distant təhsil standart olaraq effektiv deyil. Maksimum səmərəlilik üçün yaxşı hazırlanmış təhsil proqramı təşkil etməlisiniz. Distant təhsildə səmərəliliyi artırmağın səkkiz yolunu təqdim edirik (Keegan, 1995):

**Təklif 1. Tədris bacarıqlarınızı uyğunlaşdırmaq**

Distant təhsildə tədris ənənəvi sinif təhsilindən fərqli bir təcrübədir. Siz sinfə rəhbərlik etməkdə rahat olsanız da, fiziki təmasların olmaması enerjinizi azaltmaq riskinə malikdir. Beləliklə, ünsiyyət və tədris bacarıqlarını bu yeni təhsil formasına uyğunlaşdırmalısınız. Güclü vokal və vizual

çatdırılma distant təhsildə olduqca vacibdir. Qarşı istifadəçi tərəfi tutmaq üçün effektiv bədən dili, ardıcıl səs tonu və kifayət qədər audio və vizual keyfiyyətə malik texniki vasitələrlə özünüzü uğurla təqdim etmək faydalı ola bilər (Holmberg, 1985).

**Təklif 2. Ünsiyyət üsullarını təkmilləşdirmək**

Distant təhsildə virtual ünsiyyət hər cür öyrənmənin açarıdır və distant təhsil də istisna deyil. Təlimatçılar və istifadəçilər arasında pozitivlik və faydalı dialoq effektiv öyrənməni təmin etmək üçün çox vacibdir. Distant təhsildə istifadəçilərinizlə eyni fiziki mühiti paylaşmadığınız üçün effektiv ünsiyyəti təmin etmək üçün çox diqqətli olmaq lazımdır.

Ünsiyyət zamanı istifadəçiləri, onların güclü və zəif tərəflərini tanımaq lazımdır. Video zənglər və ya yaxşı yazılmış mətnlər kimi müxtəlif kanallar vasitəsilə gecikmədən rəy bildirmək üçün vaxt ayırmağınızı tövsiyə edirik.

Vedubox (hamısı bir yerdə) kimi inteqrasiya olunmuş e-tədris sistemləri istifadəçilərlə ünsiyyət qurmaq üçün geniş alternativlər təklif edilir. Onlarla Word, PDF və ya video formatında istənilən sənədi və daha çoxunu paylaşmaq lazımdır. Burada həmçinin istifadəçilərə dərs zamanı fikirlərini bölüşmək üçün mikrofonlarını aktivləşdirmək üçün icazə vermək lazımdır.

**Təklif 3. Media imkanlarından istifadə etmək**

Mediadan istifadə distant təhsilin ən mühüm aspektlərindən biridir. Dərsləri istifadəçilər üçün ibrətamiz və cəlbedici etmək üçün müxtəlif media formalarına ehtiyacınız var. Böyük onlayn resurslar sayəsində buna nail ola bilərsiniz.

Məlumdur ki, medianın müxtəlif formaları səmərəliliyin artırılmasının açarıdır, çünki hər kəs fərqli üsulla öyrənir. Məsələn, vizuallaşdırma əksər istifadəçilər üçün olduqca faydalıdır. Mühazirələrinizlə yanaşı, informativ qrafiklər və videolar kimi maraqlı vizual materiallardan istifadə etmək faydalıdır. Burada hətta oyunlardan istifadə etmək də çox faydalı olur (Əlizadə, 2019; Cakiroghlu, Erdoghdu, Kokoc, Atabay, 2017).

**Təklif 4. Bulud texnologiyasında saxlamaq**

Bulud öyrənmə istifadə edilə bilən mənbələrin onlayn mühitdə saxlandığı öyrənmə növüdür. Yüksək yaddaş tutumu ilə bulud bütün təhsil mənbələrinizi paylaşmaq üçün mükəmməl bir mühitdir. Beləliklə, fayllarınıza çatmaq asan və qalıcı olacaq.

Bulud texnologiyasından istifadə materiallarınızı sifariş etməkdə və qeydlər saxlamaqda öyrənənlərə kömək edir. Bu zaman həmçinin istifadəçiləri müxtəlif materialları paylaşmağa təşviq etmək lazımdır.

**Təklif 5. Müzakirə forumlarına rəhbərlik etmək**

Sinif müzakirəsi effektiv öyrənmənin başqa bir yoludur, çünki bu, sadəcə mühazirələrə qulaq asmaqdansa, istifadəçilər üçün olduqca əyləncəli və cəlbedicidir. Buna görə də fiziki təmasda olmasalar da, onların bir-biri ilə əlaqəsi vacibdir. Müzakirə forumları mütləq öyrənənlərin iştirakını artırır.

Buna nail olmağın əsas yolu müzakirə forumlarıdır. Təlimdə mövzuya başlayaraq onları töhfə verməyə dəvət etmək öyrənənləri təlimə həvəsləndirir. Bu hal onların özlərini ifadə etmək üçün asan olacaq. Yadda saxlamaq lazımdır ki, onlar öz müəllimlərindən öyrəndikləri qədər bir-birlərindən də öyrənirlər.

**Təklif 6. Öz-özünə öyrənməyə kömək etmək**

Distant təhsil istifadəçilər tərəfindən bir növ həvəsi əhatə etməlidir. Beləliklə, distant təhsilin bir hissəsi öz-özünə öyrənmədir. Mükəmməl müəllim faydalı təlimlər təqdim etməklə, öz-özünə öyrənmə ehtiyacını ödəməlidir.

İstifadəçiləri özlərini idarə edən öyrənmə prosesində çətinlik çəkdikləri zaman onların suallarına kifayət qədər cavab vermək üçün səy göstərməlisiniz. Həmçinin yadda saxlamaq lazımdır ki, şagirdlərdən bəziləri həmişə digərlərindən daha çox maraqlanır və həyəcanlanır. Onlara kömək etmək üçün əlavə resurslar təqdim etməyi bacarmaq lazımdır.

**Təklif 7. Çevikliyi təşviq etmək**

Distant təhsilin üstünlüklərindən biri də vaxt çevikliyi üçün yer olmasıdır. Təlimatçı kimi bu çevik mühitin bir hissəsi olsanız, bütün istifadəçilərinizin ümumi səmərəliliyini artıra bilərsiniz. Hər

bir şagirdin fərqli və məhsuldar vaxtını nəzərə alaraq, son tarixlər vasitəsilə onların məhsuldarlığını və çevikliyinizi təşviq etmək lazımdır. Onların diqqətini yayındırmamaq üçün çeviklik dərəcəsinə diqqət yetirmək faydalı ola bilər.

**Təklif 8. Hərtərəfli qiymətləndirmə aparmaq**

Virtual öyrənmədə istifadəçinin biliyini yoxlamaq təhsil prosesinin bir hissəsidir. Distant təhsildə onları müşahidə etmək şansı məhdud olduğundan uyğun meyarlar seçmək lazımdır. Vaxtı səmərəli idarəetmə, kommunikasiyanın düzgün qurulması, virtual mövzunun əlçatanlığı, fəal iştirak, səmərəli qiymətləndirmə üçün hərtərəfli meyarlar, eyni zamanda suallar hazırlamaq daha çox məqsədəuyğun olur (Vheeler, 2002; Vygotsky, 1930/1978).

Şagirdlərə virtual şəkildə diqqətlə hazırlanmış suallar verərkən onların çatışmayan məqamlarını asanlıqla aşkar edə bilər və fiziki təmasınız olmasa da, bəzi mövzuları təkrarlaya bilməsi qəbuledilləndir. Məsafələrə baxmayaraq, düzgün qiymətləndirmə metodu distant təhsildə səmərəliliyin artırılmasında olduqca faydalıdır (Vyatkina, V'yugina, 2018; Iksanova, Khayrullina, Vyatkina, 2018).

Distant təhsil öyrənməni asanlaşdırmaq üçün uzun bir yol keçmişdir. Bu təkliflərin köməyi ilə onu daha da təkmilləşdirmək olar. İstənilən yaşda olan istifadəçilər istənilən yerdə və istədikləri vaxt asanlıqla bilik və sinif məmnuniyyəti əldə edə bilərlər.

## Nəticə

Beləliklə, distant təhsildə keyfiyyətli tədrisə qoşulmaq bir sıra təkliflərin məzmunuda olan yenilikləri qəbul edir və virtual mədəniyyətin formalaşmasında böyük rol oynayır. Məqalə sübut edir ki, virtual təhsil elementləri olmadan onun keyfiyyətindən danışmaq mümkün olmaz. Distant təhsilin üstünlüklərindən bəhs edən yeni təkliflər tədris bacarıqlarının uyğunluğu əsasında ünsiyyət vasitələrinin rolunun zəruri olduğunu sübut edir. Media imkanlarından istifadə etməklə müzakirə forumlarına geniş yer verir. Distant təhsil təhsildə bulud texnologiyasına geniş yer verir, öz-özünə öyrənməni, çevikliyi təmin edir və sonda nailiyyətləri tanımağa dəstək verən şagird qiymətləndirilməsini təşviq edir.

## Ədəbiyyat

1. İsmayılova, B. (2014). Distant təhsil: üstünlüklər, çatışmazlıqlar və müsbət təcrübə. “Elektron dövlət quruculuğu problemləri”. I Respublika elmi-praktik konfransı, 4 dekabr, s. 189-192.
2. Basol, G., Balgalmis, E. (2016). A multivariate investigation of gender differences in the number of online tests received-checking for perceived self-regulation. Computers in Human Behavior, 58, pp. 388-397. https://doi.org/10.1016/j.chb.2016.01.010
3. Cakiroghlu, U., Erdoghdu, F., Kokoc, M., Atabay, M. (2017). Student’s preference in online assessment process: Influence on academic performance. The Turkish Online Journal of Distance Education, 18(1), pp. 132-132. https://doi.org/10.17718/tojde.285721
4. Əlizadə, T. (2019). Distant təhsilin əsas modelləri və metodları. “Azərbaycan məktəbi” jurnalı, № 3 (688), s. 123-132. 16.09.2019.
http://dx.doi.org/10.29228/edu.35 http://mesafedenmekteb.edu.az/az/
5. Chemsi, G., Sadiq, M., Radid, M., Talbi, M. (2020). Study of the self-determined motivation among students in the context of online pedagogical activities. International Journal of Emerging Technologies in Learning, 15(5), pp. 17-29.
https://doi.org/10.3991/ijet.v15i05.11392
6. Garrison, R. (2000). Theoretical challenges for distance education in the 21 century: A shift from structural to transactional issues. The International Review of Research in Open and Distance Learning. June.
7. Holmberg, B. (1995). The evolution of the character and practice of distance education. Open Learning 10(2), pp. 47-53.

8. Vyatkina, I. V., V'yugina, S. B. (2018). Vozmozhnosti ispol'zovaniya innovatsionnykh tekhnologiy v obrazovatel'nom protsesse universiteta. Mezhdunarodnyy simpozium «Trudy» Nadezhnost' i kachestvo. T. 1, s. 247-277.
9. Iksanova, A. S., Khayrullina, Ye. R., Vyatkina, I. B. (2018). Prepodavaniye gumanitarnykh distsiplin s ispol'zovaniyem informatsionno-kommunikatsionnykh tekhnologiy. V sbornike: Problemy inzhenernogo i sotsial'no-ekonomicheskogo obrazovaniya v tekhnicheskom vuze v usloviyakh modernizatsii vysshego obrazovaniya. Materialy IX Mezhdunarodnoy nauchno-metodicheskoy konferentsii. Otv. red. S. D. Pogorelova, s. 417-421.
10. Keegan, D. (1995). Distance education technology for the new millennium: Compressed video teaching. ZIFF Papiere IO 1. ERIC, pp. 89-93.
11. Holmberg, B. (1985). The feasibility of a theory of teaching for distance education and a proposed theory. ZIFF Papiere 60. ERIC, ED 290013.
12. Vheeler, S. (2002). Student Perseptions of Learning Support in Distanse Education. Quarterly Reviev of Distanse Education, 3(4), pp. 419-430.
13. Vygotsky, L. S. (1930/1978). Mind in Sosiety: The development of higher psychological prosesses. Harvard University Press.

Göndərilib: 17.04.2024 Qəbul edilib: 31.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/21-25

**Şükufə Vəliyeva**
AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu
filologiya üzrə fəlsəfə doktoru
valiyevashukufa@gmail.com

# ABŞ TƏNQİDİ REALİZMİNİ FORMALAŞDIRAN AMİLLƏR

**Xülasə**

ABŞ üçün dağıdıcı təsirə malik olan Vətəndaş və Dünya müharibələrinin gedişində acı müharibə taleyinə düçar olmuş insanlar çarəsiz şəkildə istehsal sənayesinin qurbanına çevrilmişdi. XVIII əsrin sonlarından etibarən ABŞ-da baş verən sənaye, mədəni və sosial inkişaflarla bağlı olaraq savadlılıq realizmə öz töhfəsini verdi. ABŞ realizmi fonunda yaranan tənqidi realizm ABŞ mənzərəsinin mədəni coşqunluğuna, gündəlik həyat qayğıları ilə bağlı insanlara və hadisələrə diqqət yönəltmək üçün sənətdən daha da geniş hərəkatın bir hissəsinə çevrildi. ABŞ-da sənayenin inkişafı ilə savadlılığın və əhalinin artımı da realizmin inkişafına öz töhfəsini verirdi. Müəlliflər real insanları real vəziyyətdə təsvir etməyə başladılar. Həyatın dinamik dərkinin müxtəlifliyi, fərdi üslubların yeni çalarla nümayiş olunması ABŞ ədəbiyyatında ideal həqiqət axtarışlarını özündə əxz edir. Tənqidi realizm ABŞ ədəbiyyatında uzun müddət davam edən, bu gün də özünü büruzə verən bir ədəbi formasiyadır.

***Açar sözlər:*** *realizm, ideologiya, kapitalizm, ədəbi tənqid*

**Shukufa Valiyeva**
ANAS Institute of Literature named after Nizami Ganjavi
Doctor of Philosophy in Philology
valiyevashukufa@gmail.com

## Factors shaping critical realism in the literature of the USA

**Abstract**

During the course of the Civil and World Wars, which had a devastating effect on the United States, the bitter war-torn people became helpless victims of the manufacturing industry. Literacy contributed to realism in connection with industrial, cultural, and social developments in the United States from the late eighteenth century. Emerging from the background of American realism, critical realism became part of a broader movement beyond art to focus on the cultural exuberance of the American landscape, on people and events related to the concerns of everyday life. With the development of industry in the United States, the growth of literacy and population also contributed to the development of realism. Authors began to depict real people in real situations. The diversity of the dynamic understanding of life, the display of individual styles in new shades embodies the search for the ideal truth in American literature. Critical realism is a long-standing literary formation in American literature that is still evident today.

***Keywords:*** *realism, ideology, capitalism, literary practice*

## Giriş

### ABŞ tənqidi realizmini formalaşdıran amillər

XIX əsrin sonu – XX əsrin əvvəllərində Amerika Birləşmiş Ştatlarının fəlsəfi, ədəbi və mədəni düşüncə tərzini modern insan və onun problemləri əhatə edirdi. Təsadüfi deyil ki, ABŞ ədəbiyyatının böyük hissəsini təşkil edən tənqidi realizm ənənələri xüsusi formasına, mənəvi-ruhi əhəmiyyətinə və ABŞ ictimaiyyətində baş verən proseslərə təsir gücünə görə bütün dünyada geniş oxucu kütləsinin rəğbətini qazanmış, mütərəqqi mövqeyi ilə fərqlənən yazıçılarının əsərləri dünya ədəbiyyatında əks-səda doğurmuşdur. 1865-ci ildə Amerika Vətəndaş müharibəsinin sonuna doğru

daha çox populyarlaşan Realizm hərəkatı XX əsrə qədər davam etdi. Tənqidçi Androu Hukun fikrincə, yeni realizm mühafizəkar yeni İngiltərə quruluşuna etiraz idi (Hook, 2016: 4).

ABŞ üçün dağıdıcı təsirə malik olan Vətəndaş və Dünya müharibələrinin gedişində acı müharibə taleyinə düçar olmuş insanlar çarəsiz şəkildə istehsal sənayesinin qurbanına çevrilmişdilər. XIX əsrin sonlarından etibarən ABŞ-da baş verən sənaye, mədəni və sosial inkişaflarla bağlı olaraq savadlılıq realizmin inkişafına öz töhfəsini verdi. ABŞ realizmi ABŞ mənzərəsinin mədəni coşqunluğuna, gündəlik həyat qayğıları ilə əhatə olunmuş adi insanlara və hadisələrə diqqəti yönəltmək üçün sənətdən daha da geniş hərəkatın bir hissəsinə çevrildi. ABŞ-da sənayenin inkişafı ilə savadlılığın və əhalinin artması da realizmin inkişafına öz töhfəsini verirdi. Müəlliflər real insanları real vəziyyətdə təsvir etməyə başladılar. Estetik qənaətlərin hekayə, roman əsasında inikası, Amerika ədəbiyyatında uzun müddət davam edən, bu gün də özünü ara-sıra büruzə verən bir ənənədir. Həyatın dinamik dərkinin müxtəlifliyi, fərdi üslubların yeni çalarla zənginləşməsi ABŞ ədəbiyyatında fərd daxilində axtarılan ideal həqiqət axtarışlarını özündə əxz edirdi. Realizmin yaranma prinsiplərinə nəzər yetirərkən, belə nəticəyə gəlirik ki, XIX əsr amerikan realizmi xüsusi formada tənqidi realizm bütün xüsusiyyətlərini təkcə öz sosial-tarixinə, fəlsəfi ənənələrinə deyil, həmçinin Avropanın maarifçi tənqidi realist ədəbiyyatının təcrübəsinə, xüsusilə ingilis və fransız ədəbiyyatınının ədəbi ənənələrinə söykənərək inkişaf etmişdir. Fransada Onore de Balzak, Stendalın əsasını qoyduğu "naturalist məktəb"in yaranması, əlbəttə, ABŞ realizminin yaranmasına mühüm təsir etmişdir. Yaşadığı dövrün qurbanı kimi təqdim olunan baş qəhrəmanın dünyaya realist baxışı əsas göstərici hesab edilən tənqidi realist əsərlər oxucuda həqiqilik, yumoristik, patetik, təəccüb, laqeydlik və nifrət əhvali-ruhiyyələrini doğurmaqla, heç şübhəsiz, amerikan cəmiyyətində daha çox şəfaverici missiyanı öz üzərinə götürmüş kimi oldu. Amerikalı tədqiqatçı Persi Boyntonun qeyd etdiyi kimi, köhnə şərtlərin sıxışdırılmasını hiss edən və sonra yeni şərtlərin azadlığından həzz alan biri qədər Amerikada həyat vəd edən heç kim daha yaxşı qiymətləndirə bilməzdi (Boynton, 2020: 47).

Bu dövrdə yazılmış əsərlərin bəziləri sosial-psixoloji xarakter daşıyırdı. Bu cərəyanın bəzi nümunələri 1830-cu illərin əvvəllərində nəzərə çarpır. Məsələn, Avqust Baldvin Lonqstritin (Augustus Baldwin Longstreet) "Corciya mənzərələri" (Georgia Scenes) (1835) adlı əsərində məzmunla forma arasında ziddiyyət özünü göstərir. Lonqstrit Corciyada başına gələn hadisələri orijinal şəkildə təsvir etmək məqsədilə bədii uydurmaya az yer verərək insanların qəddarlığını, burjua cəmiyyətinin qüsurlarını aşkarcasına tənqid edir. Avqust Lonqstritin realist ideyası oxucunun şüuruna təsir edib, bir növ, onun gələcək həyatına istiqamət verir.

ABŞ tarixində baş verən ictimai-siyasi hadisələr spesifik realist çalarla Stefan Kreyn (Stephen Crane), Villiam Din Houels (William Dean Howells), Mark Twain (Mark Tven), Sem. R. Votkins (Sam. R. Watkins) və digər ilkin tənqidi-realist yazıçıların əsərlərində öz bədii əksini tapmışdır. Bu yazıçıların əsərlərini oxuyan zaman oxucu yazıçını daxili müəllif tendensiyasına əsasən təhkiyəçi kimi qəbul edir. Bu hal yalnız realist tipli əsərlərə deyil, eyni zamanda ABŞ dövlət kimi formalaşdığı dövrdə qələmə alınmış ilkin hekayə və nağıllarda da rast gəlinir. Nağıl və eskiz ABŞ ədəbi tarixi üçün təkcə müxtəlif məzmuna malik olduqlarına görə deyil, həm də ona görə vacibdir ki, bu nümunələr vasitəsilə "əsllik hissi" və "natamamlığın qəbulu" reallaşır (Fash, 2020: 166).

Xüsusilə qeyd edək ki, Villiam Din Hovels (1837-1920) ABŞ ədəbiyyatına tənqidi realist estetika gətirən ilk amerikalı yazıçıdır. Onun 1880-1890-cı illərdə orta və yuxarı təbəqə həyatından bəhs edən hekayələrində ironik obrazlarla zəmanəsinin insan və hadisələrinə ən zərif formalı tənqidlə yaxınlaşaraq onlara xəyalpərəst, mənasız iddia və işlərlə məşğul olan obrazlar kimi müraciət edir.

Onun ən məşhur romanı olan "Silas Lafamın yüksəlişi" (1885) öz səhvləri ucbatından ironik olaraq maddi sərvətdən düşən bir insanı təsvir edir. İronik irad demək olar ki, eyham xarakteri daşıdığından Viliam Din Hauels başladığı fabulanı sonacan uğurlu şəkildə qoruyaraq öz təxəyyülündəki obrazları bədii abstraksiya prosesindən keçirməklə bədii bütövlüyün qorunub saxlanılmasını mütənasib formada əvvəlcədən hazırladığı plana daxil edə bilir (Howells, 2021: 292).

Əlbəttə, tənqidi realizm ifrat şəkildə ideallaşdırılan ədalət normaları olan yerdə qətiyyən inkişaf edə bilmədiyi üçün XVIII əsrdə yeni yaranan tənqidi-realist formalı əsərlər konseptual məzmunu ilə ABŞ ədəbiyyatı üçün aktual mövzunun əsas obyektinə çevrilmişdir (Berke, Bleil, Cofer, Davis, 2023: 957).

Tənqidi realist yazıçılardan hesab edilən Horatiyo Alcer Cuniyor (Horatio Alger, Jr.) (1832-1899) spesifik tənqidi-realist müstəvidə tam bir estetik və tənqidi fikir sxemindən ibarət süjet hazırlamağı ilə seçilən XIX əsrin məhsuldar yazıçılarından olmuşdur. Yazıçıya ən çox şöhrət gətirən onun çəkməçi, jurnalist, alverçi və digər peşələrlə məşğul olan oğlan uşaqlarının sərgüzəştlərindən bəhs edən silsilə romanlarında səfil vəziyyətində yaşayan oğlan uşaqlarının hansısa varlının təsadüfi təsiri ilə sərvət sahibi olmalarından bəhs edir. Yazıçının hekayələrində ABŞ tənqidi realizm dövrü aydın şəkildə xalis burjua əlaqələrinə tam zidd bir ideologiyanın sirayət etdiyi mərhələnin hadisəsi kimi vüsət tapmışdır. Birləşmiş Ştatlar kimi demokratik bir ölkədə agentliklərin bərabər şəkildə yenidən bölüşdürülməsini təmin etmək üçün qanunların qəbul ediləcəyini düşünmək olar (Lelekis, Lavelle, 2021: 6). Horatiyo Alcerin ədəbi eyhamlarının keyfiyyəti onun yazısını fərqli edir. Onun "Oğlanların kitabı"nda xatırlanan böyük müəlliflər arasında Şekspir, Milton, Lonqfellov, Siseron, Horatsi və başqaları var (Alger, 1887: 66).

"Mən ilahiyyatı əsasən ədəbi mədəniyyətin bir qolu kimi öyrəndim və özümü ona bir peşə kimi həsr etmək fikrim olmadı" fikirlərinin müəllifi olan Horatiyo Alcer Cuniyor əsərlərinin yarıdan çoxunda "Müqəddəs Kitab"a istinad edərək, sanki, gənclər üçün əxlaq təlimatçısı missiyasını icra edirdi. O, oğlanları biznes uğurundan daha çox təqva və əxlaqi fəzilət yoluna yönəltməklə kifayətlənirdi. Onun qəhrəmanları yaxşı talelərə layiqdirlər, çünki onlar fəzilətli gənclərdir və yazıçının bir çox kitabları gənc qəhrəmanlarının böyük firmalarda təvazökar kargüzarlıq işlərinə yiyələnməsi ilə bitir. Bu iş yerləri gənclərə sərvətdən çox mənəvi olaraq daha da yüksəlmək şansı verir. Gənc qəhrəman üçün biznes uğuru vacibdir, lakin daha vacibi hörmətli vətəndaş olmaqdır. Bu eyhamlar Alcerin ədəbiyyata dair biliklərini ortaya qoyur və işinin ədəbi keyfiyyətini artırır. Horatiyo Alcerin tənqidi realizmində bədii təsvirin həqiqiliyi xüsusilə vacib xarakter daşıyır (Alger, 2021: 47).

İnamla deyə bilərik ki, məhz ABŞ-da tənqidi realizm Qərbi Avropa mütəfəkkirlərinin və burjua ideoloqlarının təsiri ilə yaranıb formalaşmışdır. Etnik kökləri Amerika İnqilab Müharibəsi dövrünə, əsgərlərə, din xadimlərinə, şeriflərə, hakimlərə və fermerlərə gedib çıxan amerikalı yazıçı Stefen Kreyn (Stephen Crane) (1871-1900), əsasən, bədii ədəbiyyat nümunələri yazan jurnalist olmuşdur. Horatiyo Alcerdən fərqli olaraq, Kreyn həyatı ən bərbad vəziyyətdə − gecəqondularda və döyüş meydanlarında görürdü. O, ölümündən sonra adi insanın müdafiəçisi, realist və simvolist kimi uğur qazanıb (Crane, 2022: 1872).

Tənqidi realizm istər ABŞ-ın siyasi həyatını, istərsə də cəmiyyətinin dini və milli ehkamlardan törəyən əxlaq qaydalarını özlərinə güzgü kimi göstərdiyi üçün, habelə insan əxlaqına və cəmiyyətlə münasibətlərinə aid edilən hadisələrin ən çox işlənən tipi hesab edilən sosial tematikaya aid olduğu üçün nəsrin mərkəzi mövzusu hesab edilən mənəvi-əxlaqi xarakter daşıyır. Fantaziyadan uzaqlaşaraq və indiyə fokuslanaraq Amerikan tənqidi-realizmi yeni bir keçid və sıçrayış təqdim etdi – modernizmi və indiki zamanda olmağın nə demək olduğunu təqdim etdi. Bu baxımdan, Kreynin "Meqi: Küçələrin qızı" (Maggie: A Girl of the Streets) (1893) hekayəsi ən yaxşı, ən real gündəlik çalarla təsvir edilmiş ABŞ-ın tənqidi-realist romanlarından biridir. Məhz Meqinin başına gələn müsibətlər fonunda Kreyn obrazı Amerika mənzərəsinin və adi amerikalıların evdəki həyatının tükənməsini və daxili təlatümü təsvir etməyə çalışmışdır. Bu hekayə tərbiyəsiz, alkoqolik valideynləri tərəfindən məhvə məhkum olunmuş kasıb, həssas bir qızın acı hekayəsidir. Hekayə boyunca Kreyn ictimai faktları təhrif etmədən onları bədii müstəvidə real epizodlar şəklində oxucusuna təqdim edir. Əsərin final hissəsində dərin məhəbbətlə özünü fəda etdiyi sevgilisinin etinasızlığından sonra Meqi özünü saleh sayan anası tərəfindən rədd edildikdə sağ qalmaq üçün fahişə olur, lakin tezliklə ölür. Qəhrəmanın ölümü ilə yazıçı cəmiyyət və şəxsiyyət arasındakı konfliktləri daha aydın nəzərə çatdırmaq məqsədi daşıyır (Crane, 1896: 158).

Yuxarıda qeyd etdiyimiz kimi, XIX əsrin sonlarından XX əsrin əvvəllərinə qədər ABŞ-da nəhəng sənaye, iqtisadi, sosial və mədəni dəyişikliklərin nəticəsində davamlı Avropa immiqrasiya dalğası və beynəlxalq ticarət üçün artan potensial ABŞ-a artan böyümə və maddi rifah gətirdi. Yazıçılar təxəyyüllərindəki əsəri təsvir etmək üçün şəhərin təlatümlü duyğularından, fakturalarından və insanlarından istifadə edirdilər. Həyatı həqiqətən olduğu kimi təsvir etmək üçün hər cür səy göstərən realist yazıçılar romantizm və ona qədərki cərəyanlarda mövcud olan padşahlar və kraliçalar, döyüşçülər və cəngavərlər, iblislər, ruhlar, dəniz canlıları və canavarlar əvəzinə, fermerlərə, tacirlərə, hüquqşünaslara, fəhlələrə və çörəkçilərə, ayaqqabı boyacılarına üstünlük verdilər, daha dəqiq desək, ABŞ realizmində yazıçılar antik dövrlərə qayıtmaq yerinə, XX əsrin əvvəllərindəki cizgiləri və əsl reallığı bütün cəsarətləri ilə qeyd edirdilər. Romantizmdən realizmə keçid mərhələsində formalaşan ABŞ tənqidi realizminin əsas xüsusiyyəti onun forma və ideya axtarışında olan pregenerik mifin deyil, məhz həqiqi reallığın üzərində qurulmasındadır. Bu mövqedən çıxış edən yazıçılar arasında xüsusi çəkisi ilə seçilən yazıçı Viliam Din Hauels (William Dean Howells) (1837-1920) realizm haqqında təsəvvürlərini sosialist münasibətlərlə paralel inkişaf etdirməsi ilə fərqlənmişdir. Belə ki, jurnalist olaraq “Atlantic Monthly” və “Harper's Magazine” jurnallarının redaktoru rolunda və esseist və ya yazıçı kimi “Müasir nümunə” (“A Modern Instance”) və “Silas Laphamın yüksəlişi” (1885) (“The Rise of Silas Lapham”) kitabların müəllifi kimi tənqidi realizm nəzəriyyəçilərindən hesab edilir. Onun bədii yaradıcılığı orta və yuxarı təbəqənin sosial həyatı və ictimai problemlərə diqqəti cəlb edən realist hadisələri ehtiva edir.

Hauels “Silas Laphamın yüksəlişi” romanında realist personajları təqdim edir, onların fərdi qüsurlarını və güclü tərəflərini göstərərək ictimai problemləri şərh edir. Yazıçı bu romanında materialist məqsədlər və dəyərlərin ardınca gedən Silas adlı bir qəhrəmanın iş həyatı və sevgi üçbucağını izləyir, onun dözmək məcburiyyətində qaldığı ağır şərtləri işıqlandırır. Kreyn eyni zamanda daxili pafos ilə zəngin psixoloji mübarizələrə də diqqəti cəlb edərək romantizmin bəxş etdiyi sentimental, həddən artıq emosional nəsrdən qaçır. Çünki burada “həqiqət carçısı” personajlar süjetdən daha önəmlidir. Bu romanla Kreyn ABŞ ədəbiyyatında kifayət qədər az təmsil olunan bir sahəyə diqqəti cəlb edərək, bir növ digər yazıçıları psixoloji həqiqətləri olduğu kimi, uydurulmadan təsvir etməyə də təşviq etdi. Boya biznesində fürsətçilik və xəsislik xüsusiyyətləri ilə sərvət qazanan personaj Silas Lapham laphamların heç vaxt əldə etmədiyi sosial şöhrəti qazanmaq üçün qızının aristokrat Kori (Corey) ailəsinə ərə getməsini istəyir. Burada ən mühüm cəhət odur ki, müəllif reallığı təfərrüata diqqət yetirərək təsvir edir. Fikrimizcə, hekayədə baş verən hadisələrin vaxt və şəraitlə müqayisədə inandırıcı göstərilməsi yazıçının xüsusi məharəti hesab edilə bilər. Silasın işini idarə edərkən iş əxlaqı, davranışı, eyni zamanda İrenin eşq macərası iki hekayəni bir araya gətirən eyni materialist dəyərlər toplusuna əsaslanır. Silas sevgi cəhətdən xoşbəxtlik qazansa da, tamahkar səhvləri sayəsində işini və gəlir qaynağını itirərək hörmətdən düşür. Yazıçının fikrincə, Silas özünün əvəzinə başqalarını düşünmək və mənəvi cəhətdən daha yaxşı olmaq üçün səyahətə başlamalıdır. XIX əsrin əvvəllərində ABŞ yazıçıları ingilislər kimi zərif yaza bildiklərini sübut etməyə çalışdıqları üçün sentimental və ya təmtəraqlı olmağa meyil edirdilər. Güclü, realist danışıq dilində amerikan nitqinə əsaslanan Mark Tvenin yazı manerası ABŞ yazıçılarının milli tərzlərinə yeni ədəbi qiymət verdi (Tuckey, Sanderson, Stein, Anderson, 2000: 34).

Mark Tven ölkənin daxili bölgələrindən gələn ilk böyük müəllif idi və onun fərqli, yumoristik jarqon və ikonoklazmını ələ keçirdi. M. Tveni zorakılıq problemi dərindən düşündürürdü. Yaradan tərəfindən yumor yaratmaq istedadı verilmiş yazıçıda yalanı gülüş hədəfinə çevirib qəhqəhəli sarkazm yaratmaq hünəri, əlbəttə, təsadüfi ola bilməzdi. Yazıçının yumor “tülünə” bürünmüş, əslində, olduqca acı pafosunun mənfi ideoloji doqmalarla sıx bağlılığı danılmazdır. Belə ki, M.Tven “Qəribə təcrübə”, “İnsan nədir?”, “Eskimos qızın məhəbbət hekayəsi”, “1.000.000 funt sterlinlinqlik qəbz” və s. hekayələrində insan məsələsini təhkiyənin ön planına çıxarıb. Yazıçılıq qayəsinə sədaqətlə riayət edən Mark Tven vətəninin hüdudlarında baş verən qızğın anti-quldar müharibəsini qeyd-şərtsiz qəbul edən mövqeyinə rəğmən, təkcə dövlət məmurlarını deyil, eyni zamanda yerli qəbilələrin törətdiyi, heç bir ağıla, məntiqə sığmayan zorakılıqları da tənqid edirdi (Twain, 1867: 16).

## Nəticə

Nəticə olaraq qeyd edək ki, realizmin postulatları əsasında ABŞ tənqidi realizminin bədii yumor, satira, tənqidi hədəfləri təhlil edilmiş və bu qənaətə gəlinmişdir ki, XVIII əsrin sonlarından etibarən XX əsrin əvvəllərinədək ABŞ yazıçıları üçün realizm sadəcə ədəbi vasitə yox, eyni zamanda həqiqəti söyləmək və köhnəlmiş ənənəni yenisi ilə – daha işlək və anlaşılan ilə əvəz etmək üsulu idi.

## Ədəbiyyat

1. Hook, A. I. (2016). American Literature in Context: 1865-1900. Taylor & Francis, p. 4.
2. Boynton, P. H. (2020). A History of American Literature. Outlook Verlag GmbH, p. 47.
3. Fash, L. G. (2020). The Sketch, the Tale, and the Beginnings of American Literature. University of Virginia Press, 166 p.
4. Howells, W. D. (2021). The rise of Silas Lapham. Independently Published, 292 p.
5. Berke, A., Bleil, R., Cofer, J., Davis, D. (2023). Writing the Nation: A Concise Introduction to American Literature 1865 to Present. DigiCat, 957 p.
6. Lelekis, D., Lavelle, J. F. (2021). The Working Class in American Literature. Essays on Blue Collar Identity. McFarland, Incorporated, Publishers, p. 6.
7. Alger, H. J. (1887). The Cash Boy As the Name Implies. Is a Story about a Boy and for Boys. Create Space Independent Publishing Platform, p. 66.
8. Alger, H. J. (2021). Selected Stories of Horatio Alger Jr.: Horatio Alger Jr. Chronicles Tales of Hard Work and Success by Horatio Alger. Jr., Prabhat Prakashan, p. 47.
9. Crane, S. (2022). Stephen Crane: Collected Works. DigiCat, 1872 p.
10. Crane, S. (1896). Maggie, a Girl of the Streets. 158 p.
11. Tuckey, S., Sanderson, M., Bernard, L., Stein, F. A. (2000). Mark Twain's fables of man. Mark Twain Foundation University of California Press, p. 34.
12. Twain, M. (1867). The Celebrated Jumping Frog of Calaveras County and Other Sketches. Angel Price, p. 16.

Göndərilib: 09.04.2024 Qəbul edilib: 20.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/26-32

**Nigar Həmidova**
Odlar Yurdu Universiteti
doktorant
ni.hamidova@gmail.com

# AKADEMİK DİSKURSDA METAFORLAŞMA

## Xülasə

Məqalə tədris prosesində akademik diskursdan bəhs edir. Akademik diskurs müəllim və tələbə arasında qarşılıqlı əlaqəni müəyyən etmək üçün ifadə edilir. Məqalədə bildirilir ki, akademik diskurs müxtəlif təhsil müəssisələrində informasiya mübadiləsi çərçivəsində istifadə olunur. Məqalədə həmçinin vurğulanır ki, akademik diskursun strukturuna pedaqoji, didaktik, elmi, tədris və təlim növləri daxildir. Məqalə akademik diskursun strukturunu araşdırır. Müəllif əvvəlcə "diskurs" anlayışının yaranma tarixi haqqında bir qədər məlumat verir, mətn ilə diskurs arasındakı fərqlərə toxunur. Məqalədə akademik diskursun müxtəlif təriflərinə müəllifin münasibəti də açıqlanır.

Beləliklə, hər bir dil ayrı-ayrı diskurslarda metaforlaşma hadisəsinin baş vermə səbəblərinə görə unikal (nadirlik) və öz xüsusiyyətləri ilə seçilir.

Tədqiqat göstərir ki, diskursada metaforlaşma prosesinin öyrənilməsi konseptual metafora nəzəriyyəsinin nailiyyətidir, onun səviyyəsini müəyyənləşdirir. Belə yanaşma nəticəsində metaforanın mürəkkəb verbal-obraz kompleksi, obraz sistemi, konsentrasiya cəhətləri aydınlaşdırılır, həmin xüsusiyyətlərin tədqiqinə imkan verilir.

***Açar sözlər:*** *akademik diskurs, metafor, metaforlaşma, məzmun, ünsiyyət*

**Nigar Hamidova**
Odlar Yurdu University
Ph. D. student
ni.hamidova@gmail.com

# Metaforization in academic discourse

## Abstract

The article deals with the academic discourse in the teaching process. The academic discourse is stated to define the mutual interaction between a teacher and a student. The article states that the academic discourse is used within the framework of information exchange in various educational institutions. The article also underlines that the structure of the academic discourse includes the pedagogical, didactic, scientific, educational and training kinds. The article investigates the structure of academic discourse. Firstly, the author gives some information about the history of the notion of "discourse". The differences between the text and the discourse have been touched upon as well. The author's attitude towards various definitions of academic discourse is also stated in the article. Thus, each language is unique (rarity) and distinguished by its own characteristics due to the reasons for the phenomenon of metaphorization in separate discourses.

The study shows that the study of the process of metaphorization in discourse is the achievement of conceptual metaphor theory, its level determines.

As a result of such an approach, the complex verbal-image of the metaphor complex, image system, aspects of concentration are clarified, that is properties are allowed to be explored.

***Keywords:*** *academic discourse, metaphor, metaphorization, content, communication*

## Giriş

Diskurs və ritorika arasında olan münasibətlər qədim dövrlərdən mövcuddur. Onlar arasında güclü təsir vardır. Akademik diskurs akademik səviyyədə müxtəlif prosesləri, məsələn, danışığı, yazını, müzakirəni, dialoqu və s. özündə əks etdirə bilir. Akademik danışıqda əsaslı praqmatik yükün olması lazımi ritorik vasitədən istifadə olunduğunun göstəricisi hesab olunur. Akademik diskursda şüur, fərdlərin özünəməxsus düşünmə qabiliyyəti, sosial-elmi amillər və s. kimi hadisələr diskursun icrasında əks olunur. Akademik diskursda əsas rol birinci icraçının üzərinə düşür. Söhbət dərs prosesindən gedirsə, bu şəxsin müəllim olduğu düşünülür. Akademik diskursda müəllim və tələbə arasında sıx münasibət müşahidə olunur. Müəllim və tələbə arasında verbal və qeyri-verbal kommunikasiya vasitələri həyata keçirilir. İki şəxs arasında həyata keçirilən bu cür kommunikasiya ikitərəfli icra olunur və hər iki tərəf bu prosesdə eyni rolu oynayır.

Akademik diskursu icra edən şəxs tələbəyə, oxucuya verdiyi məlumatın dəyəri, məqsədi barədə məsuliyyət daşıdığını anlayır. Məqsəd diskursu dinləyəni, yaxud oxuyanı inandırmaq və ötürdüyü məlumatı ona anlatmaqdır. Tələbəni inandırma diskurs iqtisadçısının özünə olan güvəninə, onun ötürdüyü məlumat haqqında olan biliklərinə, eyni zamanda fon biliklərinə və s. uyğun olaraq inandırıcı ola bilər. Bu zaman ritorikanın rolu ortaya çıxır. Akademik diskurs zamanı lazım olan müvafiq ritorikanın seçilməsinə diqqət yetirmək lazımdır. Məsələn, dərs diskursunda müəllim əvvəlcədən müəyyən olunmuş məlumatı çatdırmaq üçün tələbələrin koqnitiv biliklərini nəzərə almalıdır. Belə ki, akademik diskursu göndərən müəllimlə onu qəbul edən tələbələr arasında koqnitiv səviyyə eyni cür olmasa da, müəllim bunu nəzərə almalıdır. C. Lakoff məlumatı qəbul edənin koqnitiv biliklər sistemi barədə yazır: *"Koqnitiv biliklər sistemi özünün fiziki, sosial və dəgər təcrübə növlərinə əsaslanır və onlar vasitəsilə anlanılır"* (Lakoff, 1900: 39). İcraçılar arasında olan koqnitiv biliklərin əhəmiyyəti digər alimlər tərəfindən də qeyd olunur. O, konseptual metaforun bəzən koqnitiv metafor kimi qəbul edildiyini yazır. Dil və koqnitiv proseslərdə mühüm rol oynadığı müəyyən olunan metafor dil fəaliyyətinin bütün sahələrində əhəmiyyətli rol oynayır. A.Məmmədov və M. Məmmədov metafora ənənəvi yanaşmamağı iddia edirlər. Onlar yazırlar ki, *"qrammatik və semantik strukturların tam linqvistik izahı məhdud şəkildə metaforlarla əks olunur"* (Məmmədov, 2010: 47). R. Uodak yazır: *"Dil öz-özlüyündə heç bir gücə malik deyil və yalnız güclü insanların ondan istifadəsi sayəsində güc əldə edir"* (Wodak, 2009: 35). Daha sonra o yenə də qeyd edir: *"...diskursun gücü mənanın tarixən böyümüş makrostrukturlarının təsirindən və insanların iştirakçıları olduqları dil oyunları vasitələrindən asılıdır. İştirakçıların fərdi təsiri həmin makro-strukturların dəyişməsinə töhvə verə bilər"* (Wodak, 2009: 36).

Akademik diskursda fikrin, intensiyanın tələbələrə, oxuculara çatdıran hissini, hazırladığı mətni (yazılı, yaxud şifahi) tam dolğun, inamlı şəkildə çatdırmalıdır. Bu zaman akademik diskurs iştirakçısının zahiri davranışını da vurğulamaq lazımdır: aydın, səlis danışıq, psixoloji xüsusiyyətlər, geyim və s. Ekspressiv, entuziast, spontan, sürəkli mətnlərdən ibarət diksursun inandırma imkanları daha çoxdur. Auditoriyanın inamı münasibətlərin istiqamətinə, anlamağa və diskursun qiymətləndirilməsinə təsir edən hərəkətlərin ardıcıllığı hesab edilə bilər. İcraçı seçdiyi söz və ən əsası düzgün və yerində işlətdiyi metaforla lazım olanı tələbələrə çatdıra bilir. Metafor müxtəlif kontekstlə bağlı olur və ona görə də akademik diskursda bəzən rast gəlinir. Metaforun işlədilməsi onun dinləyənlərdə fərqli və maraqlı implikasiyalar yaradır. Metaforun istifadəsi onu işlədənin fon biliyinə və mədəni freyminə uyğun olaraq inferensiya və şərh olunur. Araşdırmalar göstərir ki, bütün sözlərin metaforik mahiyyəti var. Elə bu səbəbdən də G. Lakoff iddia edir ki, metaforlar yalnız bədii üsluba aid deyillər. O, iddia edir ki, insanlar real həyatda da metafordan istifadə edirlər və bu məsələdə biz də onunla razıyıq (Lakoff, 1980: 202).

C. Lakoff konseptual metaforların və onların əsasında metaforik ifadələrin yarandığını qeyd edir. Akademik diskursda iştirakçılar verbal və qeyri-verbal auditoriyalara təsir etmək üçün bütün dil vasitələrindən istifadə edə bilər. Metaforik düşüncə insanın əsas yaradıcı qabiliyyəti hesab edilir. Çünki düzgün situasiyada düzgün metaforun istifadəsi insanın fərdi düşüncəsindən qaynaqlanan bir şeydir.

G. Lakoff və M. Conson iddia edirlər ki, metaforların diskursda istifadə olunması koqnitiv mexanizm kimi dəyərləndirilə bilər. Belə ki, bu zaman bir konsept digər konseptə keçid edir və insanların həmin konseptləri anlamaları çətinlik törətmir (Lakoff, 1980: 14).

Məsələn, belə bir nümunə verək:

*"In today's class, I will map out the most important concepts (Bugünkü dərsimizdə sizə ən əhəmiyyətli konseptlərin planını təqdim edəcəm.). Map out* birləşməsinin izahı – *"to plan in detail how something will happen"* (Longman Active Study Dictionary, 1963: 869).

Bu cümləni oxuyanda ilk əvvəl düşünə bilərik ki, nə isə xəritə ilə bağlı bir şey haqqında danışılacaq. Mənbə və hədəf parametrləri fərqləndirilir. Mənbə dərsdir, hədəf isə izahdır. Bu cümlədə istifadə olunan mücərrəd məfhum, yəni izah hədəf predmeti adlanır. Əsas və mənbə predmet isə dərsin mövzusudur. Müəllim tələbələrə artıq dərsə keçid aldığını, onların diqqətli olmalarını və dərsin planının hazır olduğunu anladır. Lakin qeyd etmək lazımdır ki, hədəf və mənbə predmetlər arasında sistemli uyğunluq olmalıdır. Belə uyğunluq "xəritəyə çəkmə" kimi adlandırılır. Xətitəyə çəkmə bizə şərait yardır ki, hədəf və mənbə predmetlər arasında olan fərqliliyi və oxşarlığı anlayaq (Goffman, 1981: 24). Məsələn, *"Lesson is an experiment"* metaforunun xəritəsini hazırlayaq:

- hər bir dərs təcrübədir;
- təcrübə zamanı fərqli situasiyalarla qarşılaşdığın kimi dərs zamanı da fərqli məlumatlar əldə edirsən;
- dərsin gedişatı müəllimin izahından, onun dərsə girişindən, sual-cavabdan, müəllimin və tələbələrin dünyəvi biliklərindən asılıdır;
- dərs zamanı rast gəlinən çətinlik təcrübə zamanı rast gəlinən enişli-çıxışlı vadilər kimi nəzərdə tutula bilər.

"Dərs təcrübədir" metaforu konkretdir və sonra ümumi səviyyəyə yönəlir. Bu səviyyələr arasında iyerarxik münasibətlər müşahidə olunur. Konkret səviyyəyə aid metaforlar daha yüksək səviyyəyə aid metaforların xüsusiyyətlərini mənimsəyir. Fikir verdiyimiz kimi, metafor vasitəsilə obrazdan mənaya keçid baş verir və koqnitiv səviyyədə şüurun obrazla iki əlaqəsi müşahidə olunur. A. Potebnya yazır: *"1) Obraz obyektiv hesab edilir və bütövlükdə mənaya köçürülür və metaforik mənalandırılanın xüsusiyyəti haqqında əsas yaradır; 2) və ya obraza ancaq mənaya keçid üçün subyektiv vasitə kimi baxılır və o sonrakı nəticə kimi heç bir əsas yaratmır"* (Potebnya, 1976: 20).

Akademik diskursda metaforların istifadəsi tələbələrin, yaxud oxucuların, məsələn, hər hansı bir məlumatla əlaqəli fikrindən daşındırmaya, yaxud istiqamətləndirməyə yönəldə bilər. Perlokutiv aktlarda müşahidə olunan narazılıq, təkid, fikrindən daşındırma, inandırma və s. kimi hallar metafor vasitəsilə daha asanlıqla yerinə yetirilə bilər.

Məsələn:

*"Lesson is an ideal experiment".*

*– The experiment can be carried out by any human being;*

*– The experimental relationship corresponds to the lesson plans;*

*– The experiment has its goals, and its goals correspond to the goals of the experiment;*

*– Difficulties in the experiments correspond to the obstacles in the lessons".*

İzahını belə verə bilərik ki, dərs də təcrübə kimidir. Təcrübə zamanı insan planlar qurur, hər hansı bir məqsədə nail olmağa çalışır, onu test edir, məsləhət edir, düşünür, müzakirə edir, tənqidlə qarşılaşır və nəticə çıxarır.

İndi isə *"Our teacher kept us in the dark about the plan of the new lesson"* cümləsinə diqqət edib dərs metaforunu təhlil edək. Bu cümlədə *"in the dark"* ("qaranlıqda" metorik məna; "intizarda" lüğəvi məna) metaforu işlədilmişdir. Cümlə belə tərcümə olunur: "Müəllim yeni dərsin planı barədə bizi *intizarda* (metaforik mənada "*qaranlıqda*") saxladı. Dərs prosesini yadımıza salaq. Müəllim köhnə dərsə aid lazım olan işləri, yəni sual-cavab, müzakirə, tapşırıqların yoxlanması, fərdi cavab, qiymətləndirmə və s. işləri yerinə yetirir. Daha sonra yeni dərsə keçid aldığı müddətdə dərsin mövzusu barədə məlumat vermədən hələ mövzu ətrafında bir qədər tələbələrlə müzakirələr aparır. Bu zaman belə bir cümlə işlədilə bilər.

Digər nümunələri nəzərdən keçirək:

*That class gave me food for thought.* – Həmin sinif mənə düşünmək üçün fikir verdi. *She gave us some brain food*. – O bizə bəzi fikirlər verdi. *His idea was half-baked.* – Onun fikri tam formalaşmayıb. *I'm tired of warmed-over theories.* – Mən bu köhnəlmiş (çeynənmiş) fikirlərdən artıq yorulmuşam. *Let me chew on that for a while.* – Qoy bu məsələ barədə bir qədər düşünüm. *I've been ruminating on that topic for a while.* – Mən bir müddətdir ki, bu məsələ barədə ciddi düşünürəm.

İnanmaq udmaq deməkdir:

*The students swallowed whatever information the teacher gave them*. – Tələbələr müəllimin onlara verdiyi hər bir məlumatı anladılar, başa düşdülər. *The teacher spoon-fed them the information.* – Müəllim məlumatı onlara tam başa saldı (yaxud müəllim məlumatı onlara yedirtdi). *The dean insisted on sugar-coating the teacher’s warnings.* – Dekan təkid etdi ki, müəllim xəbərdarlığını bir qədər yüngülləşdirsin (yaxud bir qədər yumşaltsın, daha mülayim etsin). *We have a live satellite feed from London.*

Xatırlama təkrar etmə deməkdir:

*We have to regurgitate everything we learned on the final.* – Biz son semestrdə öyrəndiklərimizi təkrar etməliyik. *Can you spit back what I told you?* – Dediklərimi təkrar edə bilərsən?

Göründüyü kimi, akademik diskursda metaforlar vacib rol oynayırlar. Akademik diskurs zamanı metaforların istifadəsi tələbələrin beynində sanki *“brain storm”* (beyin fırtınası) yaradır. Tələbə düşünür, yaddaşını təzələyir, maraqlanır, fikrini dəyişir, fəallaşır.

Məsələn, müəllim deyir: *This is a fatal mistake* (Bu səhv qərardır). *It is a waste of money* (Bu pul itkisidir) və s. kimi metaforlar artıq insanların beynində öz yerini tutmuş hesab olunur və onların akademik situasiyada bu cür terminləri işlətməsi öz təsiredici effektini göstərir.

Nümunəyə nəzər salaq:

Öyrənmə yeməkdir:

*They ate the lesson up*. – Onlar dərsi başa düşdülər (yaxud onlar dərsi yedilər). *They gobbled up the ideas.* – Onlar fikirləri götürdülər (yaxud onlar fikirləri qapdılar / qamarladılar). *He has an appetite for learning.* – Onun öyrənməyə həvəsi var (yaxud onun öyrənməyə iştahı var). *She has an insatiable curiosity.* – Onun öyrənməyə doymaz marağı var (bitib-tükənməz istəyi var). *School nourishes your mind.* – Məktəb sənin beynini qidalandırır (yaxud məktəb səni savadlı edir, sənə savad verir). *That's a very meaty book.* – Bu kitabda məlumat çoxdur (yaxud bu kitab çox zəngin məlumatlı kitabdır). *She devoured every article about our country she could find*. – O bizim ölkəmiz barədə əldə etdiyi hər məqaləni maraqla oxuyur (yaxud həvəslə oxuyur).

Yuxarıda yazdığımız diskurs parçasında istifadə olunan *təhsillə* bağlı terminlərin dərs zamanı işlədilməsi tələbələrdə lazım olan konseptlərin düzgün formalaşmasında rol oynayır.

Metaforik təfəkkürü təhlil edərkən düşünürük ki, müasir metafor tədqiqatları Konseptual və Koqnitiv Metafor Nəzəriyyəsinin təkmilləşdirilməsinə yönəlmişdir. Metaforun izahında əsas diqqət onların kontekst daxilində yaxşı başa düşülməsi ilə əlaqədardır. M. Tendal yazır: *“Metaforların yaxşı başa düşülməsi üçün Hibrid Nəzəriyyəsi adlanan konsepsiyanı öyrənmək lazımdır”* (Tendahl, 2009: 145). O, bu nəzəriyyə ilə metafora koqnitiv yanaşmanın lazım olduğunu bildirir.

Linqvistik obrazların köməkliyi ilə təfəkkürdə kontekstə uyğun olaraq, emosional forma yaranır. Şüurda yaranan emosional forma, yaxud imic idrak üçün əyani situasiya rolunu oynayır. Beyindəki metaforik formalar idrak prosesində anlamanın estetik zövq səviyyəsinə uyğun olaraq rahatlıq yaradır.

Belə bir nümunə verək:

Anlama həzm etmə deməkdir:

– *It'll take some time to digest that information for the students.* – Həmin məlumatı anlamaq tələbələr üçün bir qədər vaxt aparacaq.

Göründüyü kimi, bütün nümunələrdə istifadə olunan xüsusi mövzulara aid işlədilən terminlərin akademik diskursda istifadə halları metaforlarla insanlarda düzgün təsəvvürün yaranmasına səbəb olur və nəticə də istənilən anlamın insanlarda formalaşmasına istiqamət verir.

Akademik diskursun janrlarında hesab edilən elmi məqalələri oxuyanlar, yaxud ensiklopedik yazıları oxuyan oxucular kifayət qədərdir. Ölkəmizin müstəqilliyə qədəm qoyması dilin leksik sisteminə yeni sözlərin daxil olmasına gətirib çıxartdı. A. Axundov "Dilimizə dövlət qayğısı" məqaləsində yazır: *"Yeni ictimai quruluş, siyasi mühit, iqtisadi şərait 70 ildə vərdiş etdiyimiz ictimai-siyasi, iqtisadi şəraitdən fərqləndiyinə görə dilimizin ictimai funksiyasında da bir sıra yeniliklər yarandı, dəyişikliklər baş verdi. 60 il dilimizin yazı vasitəsi olan kiril qrafikalı əlifba latın qrafikalı yeni əlifba ilə əvəz edildi. Ədəbi dilimizin yazılı və şifahi növləri əvvəlki dövrlə müqayisədə sayca olduqca çox olan kütləvi informasiya vasitələrində – qəzet, jurnallarda, dövlət və özəl televiziya kanallarında, radioda, yeni dövrün məhsulu olan təşkilat və müəssisələrin adlarında təzə xüsusiyyətlər qazanmağa başladı"* (Axundov, 2001: 27).

Ümumiyyətlə, akademik dil həmişə diqqət mərkəzində olmuşdur. İnformasiyanın geniş kütləyə ünvanlanması həmişə üstünlük təşkil etmişdir. Akademik məlumatı ötürməyin üsulları çoxdur. Elmi məqalələr, dərs prosesi, qəzet informasiyası, TV informasiyası, kitab informasiyası və s. Elmlərin inteqrasiya və diferensiya proseslərinin getdiyi dövrdə bir neçə elmin birləşməsinin şahidi olmaq olar. Hər bir terminlərin yaradıcıları mütəxəssislərdir. Tədqiqat aparılır və yeni termin yaranır. Yeni termin aid olduğu sahədə istifadə olunur. İstifadə olunan terminlər çox zaman həmin sahədə çalışan peşəkarlar tərəfindən işlədilir. Hər bir dövrdə dildə yeni yaranmalar müşahidə oluna bilər. Bu hal da dilin leksik sisteminə təsir göstərir. Dilin leksik sistemi belədir ki, oraya istənilən anda yeni termin, yaxud söz daxil ola bilər. Yəni leksik sistem açıq sistem hesab olunur. Hər bir canlı verbal dil mürəkkəb və çoxsəviyyəli quruluş hesab edilir. Dilin leksik sistemin əsas qatı hamı tərəfindən başa düşülən qatdır. Digər qatlarda terminlər, dialekt sözlər və s. yerləşir. Akademik terminlər də o cümlədən buraya aiddir. Bir neçə akademik terminin izahını verək:

Academic Session – The school year from September until April. – akademik sessiya – sentyabrdan aprelə kimi olan dərs ili;

Audit – A student may, with the instructor's permission, attend classes in a given course without receiving credit. – audit – Bu tələbə kredit almadan müəllimin icazəsilə dərslərdə iştirak edə bilər;

Baccalaureate – The degree of bachelor granted by universities and colleges. – bakalavr dərəcəsi – universitet və kollec tərəfindən tələbəyə verilən dərəcə;

Bachelor – A degree granted by a university. – bakalavr – universitet tərəfindən verilən dərəcə, ad;

Bursary – A non-repayable fund, issued based on individual financial need and satisfactory academic status. – burs – şəxsi hesabı, yaxud kiminsə himayəsilə ödənişsiz təhsil alma haqqı;

Cognate – Courses in another discipline required for a certain concentration or major; – koqneyt – müəyyən bir iş üçün və ya böyük bir tələb üçün olan intizam kursları;

Concentration – A specific area of study in a three-year degree program – təmərküz (cəmləşdirmə) – üç illik proqram müddətində xüsusi bir sahə üzrə alınan təhsil;

Corequisite – A course which must be taken prior to or in the same term as a given course. – korikvizit – aldığı təhsildən əvvəl alınmış, yaxud həmin təhsillə eyni vaxtda alınan təhsil;

Credit – The weight value assigned to a course. – kredit – kurs üçün təyin olunmuş çəki dəyəri.

Diqqət verdiyimiz kimi, bunlar sırf akademik məqsədlər üçün işlədilə bilən terminlərdir. Onların başqa sahə üçün işlədilməsi tam anlaşılmazlığa, qarışıqlığa səbəb ola bilər.

Koqnitiv linqvistik nöqteyi-nəzərindən metaforların üç növü müəyyənləşmişdir*: orientasional metaforlar, struktural metaforlar* və *ontoloji metaforlar.*

Məkan metaforları insanların fikizi və mədəni təcrübəsindən yaranan metaforlardır. Onların əsasında sadə məkan quruluşlu konseptlərin mürəkkəb qeyri-məkan quruluşlu konseptlərə köçürülməsi dayanır. Bu cür metaforlarda canlılarla təbiət arsında interaktiv fəaliyyət dayanır. Məsələn, *up-down, in-out, front-back, on-off, deep-shallow, central-peripheral* və s. G. Lakof və C. Conson iddia edirlər ki, məkan bildirən orientasiya orientativ terminlər vasitəsilə mücərrəd konseptlərin anlaşılması üçün qeyri-adi zəngin mənbə yaradır (Lakoff, 1980: 10).

Struktural metafor mücərrəd, duyulmayan hədəf məfhumları konkret, duyulan mənbə məfhumları vasitəsilə başa düşülür. Mürəkkəb qurluşlu mənbə konseptləri vasitəsilə hədəf metaforlarının dərk edilməsi bu metaforlar vasitəsilə həyata keçirilir (Goffman, 1981: 31).

Məsələn, *"Learning is gold" – "Təhsil alma (öyrənmə) qızıl dəyərindədir"*. Bu metaforun köməkliyi ilə insanlar təhsilin hansı səviyyədə olduğunu, təhsil almağın çox qiymətli olduğunu təsəvvürlərində canlandıra bilirlər (Goffman, 1980: 34).

Fiziki aləm haqqında, məsələn, fiziki obyektlər, məfhumlar ontoloji metaforlar üçün mənbə hesab edilə bilər. Ontoloji metaforlar vasitəsilə insanlar sifətlər, emosiyalar, fikirlər, məfhumlar və s. arasında əlaqəni və oxşarlığı anlaya bilirlər. Bunu əlavə edə bilərik ki, ontoloji metaforlar mücərrəd ideyalar və konseptləri birləşdirir. Ontoloji metaforların istinad, kəmiyyət müəyyənetmə və yerləşdirmə kimi funksiyaları müəyyənləşdirilib (Goldenberg, 1980: 23). Məsələn, qeyri-fiziki və mücərrəd konsept: *the mind* (beyin), hadisələr: *going to the lesson* (dərsə getmək); hərəkət: *giving somebody education* (kiməsə təhsil vermək) və s. (Goldenberg, 1993: 32).

Metaforlar konqnitiv proseslər hesab olunur və metaforların akademik diskursda işlədilməsi mənbə və hədəf parametlər arasında əlaqənin və oxşarlığın insanlar tərəfindən anlaşılmasına şərait yaradır. Oxşarlıq və təcrübəyə əsaslanan korrelyasiya mənbə və hədəf parametlər arasında körpü yaradır. Bu qeyd etdiyimiz oxşarlıq və təcrübəyə əsaslanan korrelyasiya metaforun bünövrəsi hesab edilir.

Akademik diskursun kommunikativ funksiyası danışıq aktları ilə sıx bağlıdır. Danışıqda müşahidə edilən dil vahidlərinin leksik, qrammatik vasitələri müxtəlif danışıq funksiyalarını həyata keçirmələri ilə reallaşır. Danışıqdakı semantik və formal amillər arasında qarşılıqlı münasibətlər, kommunikativ aktlar və s. diskursun başa düşülməsinə şərait yaradır.

Dildən kənarda mövcud olan məna, danışığın həyata keçirildiyi mühit, eksplisit və implisit intensiya, iştirakçıların bir-birinə münasibəti, ünsiyyətin baş vermə şəraiti və s. praqmatika ilə bağlıdır.

M. Gotti yazır ki, *"xüsusi leksikanın ən geniş yayılmış fərqləndirici xüsusiyyəti "monoreferentallıq" hesab olunur"* (Gotti, 2006: 25). Bu da onu ümumi dildən fərqləndirir. "Monoreferentallıq" verilmiş kontekstdə istifadə olunan sözlərin bir əsas mənasının istifadəsinə imkan yaradır. Elə bu səbəbdən də, iqtisadi diskursda xüsusi ixtisas sözündən istifadə etmək lazımdır (Gotti, 2011: 221).

Xüsusi diskursdakı xüsusi leksika referensial dəqiqliklə xarakterizə olunur; bu zaman xüsusi kontekstdə xüsusi məna istifadə olunur, yəni səthi formada. M. Gotti izah edir ki, konvensional şəkilçilərin istifadəsi ən çox istifadə olunan texnikadır və bu da xüsusi diskursda şəffaflıq yaradır. O yazır: *"Bu cür şəffaflıq sistemliliyin və standartlaşmanın nəticəsi kimi hər disiplində dəqiq dəyər tələb edir. Onların quruluşu terminlərin katalogiyasını tənzimləyir və eyni zamanda inkan yaradır ki, hər kateqoriya yüksək səviyyədə təşkil olunsun və kodlaşdırılsın və bu proses açıq sistem vasitəsilə həyata keçirilir"* (Gotti, 2011: 30).

## Nəticə

Xüsusi disiplinlərdə şəkilçilərin dəqiq mənası və funksiyası olur. Xüsusi diskursda söz-yaratma ilə əlaqəsi olan ən vacib amil yığcamlılıq, müxtəsərlikdır. Məsələn, hər hansı bir konsepti ən qısa formada ifadə etmək. Bu prosesi belə təsəvvür etmək olar: mətn səviyyəsində azaltma, məsələn, affikslərin buraxılması; iki leksemin tək bir termində birləşməsi; terminin özünün daxili, yaxud terminal reduksiyası; birləşmə; sözönlərinin buraxılması və iki isimdən ibarət olan nominal qrupların təyinedicilərinin istifadəsi; akronum və abreviaturların istifadəsi.

Xüsusi diskurs ümumi dildən götürülüb yaradılmış terminlərin metaforizasiyasına (metaphorisation) diqqəti cəlb edir. Xüsusi diskursda metaforların istifadəsinin üstünlüyü də burada meydana çıxır: terminolji şəffaflıq, referensin interlokutiv semantika çərçivəsində əvvəl istifadə olunmuş terminlə yeni konseptin əlaqəsini əks etdirmək; dəqiqlik, həmsöhbətə tanış olan məlumatın cəld xatırladılması, yəni bu zaman mürəkkəb tərifə ehtiyac duyulmur; mürəkkəb və abstrakt konseptlərin dünyanın fiziki imiclərinin istifadəsi ilə sadələşdirilməsi.

## Ədəbiyyat


1. Lakoff, G. (1990). The Invariance Hypothesis: Is Abstract Reason Based on Image-Schemes? Cognitive Linguistics, No. 1, pp. 39-74.
2. Məmmədov, A. Y. (2010). Diskursn təhlilinin koqnitiv perspektivləri. Bakı: Çaşıoğlu, 96 s.
3. Wodak, R. (2009). The discourse of Politics in Action. Politics as usual. London: Palgrave Macmillan, 252 p.
4. Lakoff, G. (1980). Metaphors We Live By. Chicago: Chicago of University Press, 276 p.
5. Longman Active Study Dictionary. (1983). England: Pearson Education Limited, 869 p.
6. Goffman, E. (1981). Forms of Talk (Conduct and Communication). Pennsylvania: University of Pennsylvania Press, 335 p.
7. Potebnya, A. (1976). Estetika i poetika. M.: Iskusstvo, 613 s.
8. Tendahl, M. A. (2009). Hybrid Theory of Metaphor. Relevance Theory and Cognitive Linguistics. London: Palgrave Macmillan, 282 p.
9. Axundov, A. A. (2001). Dilimizə dövlət qayğısı. Bakı. “Dirçəliş-XXI əsr” jurnalı, № 41, s. 27-36.
10. Goldenberg, C. N. (1993). Instructional conversations: Promoting comprehension through discussion. The Reading Teacher, No. 46, pp. 316-326.
11. Gotti, M. (2006). Insights into Specialized Translation. Bern: Peter Lang, pp. 221-246.
12. Gotti, M. (2011). Investigating Specialized Discourse. Bern: Peter Lang, 240 p.


Göndərilib: 25.04.2024 Qəbul edilib: 12.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/33-39

**Ilaha Ashrafova**
Nakhchivan State University
ilahaashrafova@ndu.edu.az
https://orcid.org/0009-0000-2127-3487
**Leyla Imanli**
Nakhchivan State University
leailaimanli@gmail.com

# THE STRUGGLES OF PEOPLE FROM NON-ENGLISH SPEAKING COUNTRIES TRYING TO LIVE AS AN INTERNATIONAL STUDENT

## Abstract

Studying abroad presents a unique opportunity for students, offering numerous benefits and some challenges. To embark on this journey, students need to research programs, fulfill application requirements, secure visas, and prepare financially. The advantages include cultural immersion, language acquisition, enhanced academic opportunities, and personal growth. However, it also involves potential drawbacks such as homesickness, cultural adjustment issues, and financial strain. Careful planning and a readiness to adapt are crucial for a successful experience.

By preparing thoroughly, young people can transform their dreams into reality and gain valuable life skills. Feeling prepared and taking necessary precautions ensures a rewarding study abroad experience.

***Keywords:*** *international student, studying abroad, academic opportunities, language acquisition, adaptability*

**İlahə Əşrəfova**
Naxçıvan Dövlət Universiteti
ilahaashrafova@ndu.edu.az
https://orcid.org/0009-0000-2127-3487
**Leyla İmanlı**
Naxçıvan Dövlət Universiteti
leailaimanli@gmail.com

## İngilis dili bilməyən ölkələrdə beynəlxalq tələbə olaraq yaşamağa çalışan insanların mübarizəsi

## Xülasə

Xaricdə təhsil tələbələr üçün unikal bir fürsət təqdim etməklə yanaşı, onun çoxsaylı üstünlükləri və bəzi çətinlikləri də vardır. Bu səfərə başlamaq üçün tələbələr müxtəlif proqramları araşdırmalı, müraciət tələblərini yerinə yetirməli, vizaları təmin etməli və maliyyə baxımından hazır olmalıdırlar. Üstünlükləri yeni mədəniyyətlər və dil öyrənmək, genişləndirilmiş akademik imkanlar və şəxsi inkişafı əhatə edir. Ancaq bu, həmçinin ev həsrəti, mədəni adaptasiya problemləri və maliyyə çətinlikləri kimi potensial mənfi cəhətləri də ehtiva edir. Uğurlu bir təcrübə üçün diqqətli planlaşdırma və uyğunlaşmağa hazır olmaq vacibdir.

Gənclər hərtərəfli hazırlaşmaqla xəyallarını reallığa çevirə və üstün həyat bacarıqları qazana bilərlər. Özünü buna hazır hiss etmək və zəruri tədbirlər görmək xaricdə təhsilin mükafatlandırıcı olmasını təmin edir.

***Açar sözlər:*** *beynəlxalq tələbə, xaricdə təhsil, akademik imkanlar, dil öyrənmə, uyğunlaşma*

## Introduction

Becoming an International Student in the U.S.

If you want to study in the U.S. as an international student, there are several important steps to consider:

1. Obtain a Student Visa:

To study in the U.S. as an international student, you must obtain a student visa. The Department of State provides a 5-step guide to help with the process, including information on the types of student visas, how to apply, and whether you can work while studying.

2. Research and Apply to Programs:

It's essential to plan ahead and become familiar with U.S. student visa requirements. EducationUSA offers resources to help international students identify suitable institutions and understand the variety of options available for study in the U.S.

3. Explore Funding Options:

Understanding the costs associated with studying in the U.S. is crucial. It's important to figure out tuition costs, living expenses, and explore options for scholarships and financial aid available to international students.

4. Language Preparation:

If English is not your first language, it's beneficial to find courses to help you learn English as a second language (ESL) to prepare for studying in the U.S..5. Understand Accreditation and Recognition:

When considering U.S. institutions, it's important to ensure that the qualifications earned will be recognized globally. Additionally, understanding the accreditation of the institution is crucial for recognition of course credits and degrees (1).

Additional Considerations

− Choosing the Right Program: With over 3,000 schools in the U.S., it's important to match your program of study and degree with the right school. The Study in the USA Guide for International Students provides searchable data to help find the right program.

− Standardized Testing: If you are not a native English speaker, it's important to consider standardized testing requirements for admission to U.S. universities. Some institutions may offer specific testing options for international students who are not native English speakers.

− Financial Aid Information: International student offices and career planning and placement offices on college campuses can be valuable sources of current financial aid information. They often have catalogs and books on scholarships, fellowships, and grants (2).

− Seeking Assistance: If you need further guidance, reaching out to the department of international students or an adviser from the university can provide complete details and information about the application procedure.

Becoming an international student in the U.S. involves careful planning, understanding visa requirements, exploring funding options, and ensuring that the chosen program and institution are the right fit for your academic and professional goals.

Studying abroad is a life-changing experience that offers students the opportunity to immerse themselves in new cultures, gain a global perspective, and pursue academic excellence. However, for individuals from non-English speaking countries, the journey of becoming an international student can be fraught with challenges and struggles, particularly when studying in countries where English is not the primary language.

This essay aims to delve into the multifaceted struggles faced by international students from non-English speaking backgrounds and explore the resilience and determination they exhibit in their pursuit of academic and personal success.

One of the primary hurdles faced by international students from non-English speaking countries is the language barrier. While many of these students possess a basic understanding of English, the transition to studying in an environment where English is the primary language of instruction and communication can be daunting.

Academic lectures, readings, assignments, and social interactions all require a high level of English proficiency, which can pose significant challenges for non-native speakers. This linguistic barrier often leads to feelings of isolation, frustration, and self-doubt, as students struggle to articulate their thoughts and ideas effectively in a language that is not their own (3).

In addition to the language barrier, international students from non-English speaking countries also face cultural and social challenges. The customs, traditions, and social norms in a new country can be vastly different from those in their home countries, leading to feelings of cultural disorientation and alienation. Simple tasks such as grocery shopping, navigating public transportation, or participating in social events can become formidable obstacles for international students who are unfamiliar with the local customs and societal norms. This cultural adjustment process often requires a great deal of resilience and adaptability, as students strive to find their place in a foreign environment while preserving their cultural identity (4).

Moreover, the financial burden of studying abroad can be overwhelming for many international students from non-English speaking countries. Tuition fees, living expenses, and healthcare costs in foreign countries can be exorbitant, and not all students have access to adequate financial resources or scholarships.

As a result, many students are forced to take on part-time jobs or seek alternative sources of income to support themselves while pursuing their education. Balancing work and studies can take a toll on their physical and mental well-being, as they juggle the demands of academic rigor with the pressures of financial stability.

Despite these formidable challenges, international students from non-English speaking countries exhibit remarkable resilience and determination in their pursuit of academic success. Many students actively seek out language support programs, English language courses, and academic tutoring to improve their language skills and academic performance. They form close-knit communities with fellow international students, providing each other with emotional support, guidance, and a sense of belonging in a foreign land. Additionally, many students actively engage in cultural exchange activities, volunteer work, and language exchanges to broaden their horizons and integrate into the local community (5).

Furthermore, international students often demonstrate remarkable adaptability and resourcefulness in overcoming financial limitations. They carefully manage their finances, seek out part-time employment opportunities, and explore alternate means of financial support to sustain their education and living expenses. Their tenacity and perseverance in the face of financial adversity are a testament to their unwavering commitment to achieving their academic goals (6).

International students face a range of challenges when studying abroad. These challenges can be academic, social, and cultural in nature. Here are some of the common challenges faced by international students:

1. Academic Challenges:

International students often encounter academic challenges, including language barriers and differences in academic expectations. The English language barrier is a significant hurdle, as many students may struggle with understanding and expressing themselves in a new language. Additionally, the format of assignments and the emphasis on classroom discussions in some countries may differ from what international students are accustomed to, leading to difficulties in academic writing and participation in class discussions .

2. Social and Cultural Adjustment:

Another significant challenge for international students is the process of adjusting to a new social and cultural environment. This includes issues such as social isolation, cultural adjustment, and the need to find accommodation, transportation, and banking services in a new country. The adjustment to a new life and culture can lead to daily emotional crises related to being away from family and familiar surroundings.

cəlbedici, naviqasiyası asan və yüklənməsi tez olmalıdır. Bu, brendinizin etibarlılığını artırır və saytda daha uzun vaxt sərf etməyə səbəb olur ki, bu da satışların və müştəri loyallığının artmasına səbəb ola bilər" (11).

Biznesin inkişafı üçün rəqabət mühitinin mövcudluğu əsas şərtlərdən biridir. Rəqabətin olması üçün də inhisarçılıq aradan qaldırılmalı, monopoliya sistemi olmamalıdır.

"Biznes nə istehsal etməli, kimin üçün istehsal etməli suallarına cavab verməlidir. Bunun üçün də rəqabət lazımdır. Sahədaxili rəqabət məhsul vahidinə çəkilən xərclərin aşağı salınması, əmək məhsuldarlığının yüksəldilməsi, texniki inkişafın sürətlənməsi, məhsulların keyfiyyətlərinin yaxşılaşdırılması üçün stimul yaradırsa, sahələrarası rəqabət kapitalın bir sahədən digərinə axması yolu ilə iqtisadiyyatın optimal quruluşunu formalaşdırır, perspektivli sahələrin inkişafına şərait yaradır" (12).

## Nəticə

Müəllif müəssisənin biznes prosesinin təkmilləşdirilməsini və inkişafını tədqiq etmişdir. Müasir dünyanın intibahı biznes strukturlarının inkişafından və işinin gündən-günə təkmilləşdirilməsindən asılı olduğunu qəbul etsək, o zaman müəllifin araşdırdığı mövzunun aktuallığını dərk etməkdə çətinliyimiz olmaz. Məqalədən görünür ki, tədqiqatçı üzərində işlədiyi mövzunun öhdəsindən bacarıqla gəlməyi bacarmışdır.

## Ədəbiyyat

1. https://abdullayevkhayal.files.wordpress.com>....
2. https://azerbusiness.az>info>post
3. https://sahibkarol.biz>virtual_tehsil
4. az.techconfronts.com/17170658-business-process-...
5. az.periodicalfinance.com>Biznes
6. banco.az>az/news/muessisenin –muasir-fealiyyetinin...
7. banker.az>müəssisənin-biznes-plani-qisa-dərslik/
8. azerbusiness.az>info/post/201/
9. https://cesd.az>new>2021/03
10. https://huseynovablog.files.wordpress.com>....
11. https://www.doola.com>blog>h...
12. https://quizlet.combiznesin-əsasl...

Göndərilib: 17.03.2024 Qəbul edilib: 13.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/76-82

**Elvin Nəcəfquluzadə**
Azərbaycan Universiteti
magistrant
e07205489@gmail.com

# AZƏRBAYCAN TURİZM SEKTORUNDA FRANÇAYZİNQ FƏALİYYƏTİNİN MÜASİR VƏZİYYƏTİ VƏ GƏLƏCƏK İMKANLARI

**Xülasə**

Hansısa bir bir şəxs və ya qrup yaşadığı yeri 1 gündən 6 aya qədər müddət ərzində yeni yerlər kəşf etmək, sağlamlığının qeydinə qalmaq, dünyagörüşünü artırmaq, əylənmək, idman yarışlarını izləmək və s. kimi məqsədlər üçün tərk edirsə, bu zaman o, və ya onlar turist olur. Hər hansısa bir bölgədə turizmin inkişafı üçün öncə siyasi və iqtisadi sabitlik olmalıdır. Bundan başqa, turistləri cəlb etmək üçün təbii amillərlə yanaşı, antropogen amillər də önəmlidir. Təbii amillərə ekoloji, təbii-coğrafi amillər daxildir. Antropogen amillər dedikdə isə tarixi abidələr, muzeylər, həmçinin əyləncə məkanları, kafe və restoranlar, mehmanxanalar və s. kimi turizm obyektləri nəzərdə tutulur. Məhz bu restoranların, kafelərin, mehmanxanaların, əyləncə məkanlarının bəziləri françayzinq müqaviləsi əsasında fəaliyyət göstərirlər. Françayzinq fəaliyyəti son dövrlərdə getdikcə daha geniş vüsət almışdır. Dünyada olduğu kimi, Azərbaycanda da geniş yayılmış olan françayzinq turizm sahəsində, yəni xidmət sektorunda ölkənin təcrübəsi olduqca məhduddur.

Dünyadakı bir çox şirkətlərin ölkə ərazisində fəaliyyət göstərməsi turist axınına, şübhəsiz ki, müsbət təsir göstərir. Bu da, öz növbəsində, ölkənin və əhalinin gəlirlərinin artmasına və iqtisadi artıma gətirib çıxarır. Respublika turizm sahəsinin inkişaf etdirilməsində olduqca maraqlıdır. Hər nə qədər bu sahədə ciddi boşluqlar mövcud olsa da, dünya təcrübəsindən istifadə və onların tətbiqi vacibdir. Ölkədə françayzinq fəaliyyətinin inkişafı turizm sektorunu inkişaf etdirmək istəyən respublikanın diqqət mərkəzində olmalıdır.

***Açar sözlər:*** *turizm, françayzinq, kommersiya, biznes, müqavilə*

**Elvin Najafguluzade**
Azerbaijan University
master student
e07205489@gmail.com

# The modern state of franchising activity in the tourism sector of Azerbaijan and its future prospects

**Abstract**

If a person or group leaves their place of residence for a period of 1 day to 6 months for purposes such as discovering new places, taking care of their health, improving their outlook, having fun, watching sports competitions, etc., then he or they become a tourist. For the development of tourism in any region, there must be political and economic stability first. In addition, anthropogenic factors are important along with natural factors to attract tourists. Natural factors include ecological, natural-geographical factors. Anthropogenic factors mean historical monuments, museums, as well as tourist facilities such as entertainment venues, cafes and restaurants, hotels, etc. Some of these restaurants, cafes, hotels, and entertainment venues operate under franchise agreements. Franchising activity has become more and more widespread in recent times. The experience of the country in the field of franchising tourism, that is, in the service sector, which is widespread in Azerbaijan as well as in the world, is quite limited.

The fact that many companies from around the world operate in the country undoubtedly has a positive effect on the flow of tourists. This, in turn, leads to an increase in the country's and

population's income and economic growth. The Republic is very interested in the development of tourism. Although there are serious gaps in this field, it is important to use world experience and apply them. The development of franchising activity in the country should be the focus of the Republic that wants to develop the tourism sector.

***Keywords:*** *tourism, franchise, commercial, business, contract*

## Giriş

Françayzinq və ya franşiza dedikdə, hər hansısa bir şirkətin özünəməxsus brendinin adından istifadə etmə hüququnu bir başqa şirkətə müəyyən şərtlər daxilində, yəni imzalanan müqaviləyə uyğun olaraq verməsi başa düşülür. Bu zaman françayzer müəssisəsinin adına patentləşdirilmiş ideya, bilik, təcrübə, texnologiya, şirkətin nüfuza malik adını qarşı tərəfə müqavilə şərtlərinə uyğun olaraq satan tərəfdir. Bütün bunları alan və bunun müqabilində qarşı tərəfə royaliti (royality), yəni gəlirin müəyyən bir hissəsini verən tərəf olan françayzi bu kommersiya müqaviləsində çıxış edən tərəflərdir. “Françayzinq” fransız sözü olub, *bir haqqın başqasına verilməsi,* yəni *satılması* mənasına gəlir. Bir kommersiya müqaviləsi olaraq françayzinq dünyada olduqca geniş yayılıb və getdikcə daha çox françayzinq müqaviləsi imzalanır (Bilalov, Gülalıyev, 2015).

Hətta françayzinq müqaviləsi o qədər geniş yayılıb ki, Amerika Birləşmiş Ştatlarında (ABŞ) hər il 300 şirkət françayzinq fəaliyyətinə başlayır. Françayzinq müqaviləsinin tarixdə ilk dəfə nə vaxt, harada və kimlər arasında imzalandığına dair müxtəlif mənbələrdə fərqli fikirlər var. Françayzinq müqaviləsinin tarixi orta əsrlər dövrünə qədər gedib çıxdığını iddia edənlər var. Hələ bu dövrdə Avropada torpaq sahibi mülkədarın imzaladığı müqavilələri bəzi alimlər françayzinq müqaviləsinə bənzər müqavilələr kimi qəbul edirlər. Həmçinin bu dövrdə əsasən Avropada krallar dövlət adına vergi toplamaq hüququnu müəyyən şəxslərə həvalə edirdilər ki, bu şəxslər əsasən vergi topladıqları bölgənin kiçik hakimi olurdular. Topladıqları verginin bir hissəsi dövlət xəzinəsinə ödənilir, qalan hissəsi isə kral tərəfindən vergini toplayan şəxslərə verilirdi. Lakin hazırkı mənası ilə başa düşülən françayzinq müqaviləsi ilk dəfə ABŞ-da 1850-ci ildə (bəzi mənbələrdə 1851-ci il) John Albert Singerin tikiş avadanlıqları satan Zinger şirkətinin istehsal etdiyi dəzgahları və maşınları satmaq üçün bəzi müəssisələrlə imzaladığı müqavilədir. Ancaq maraqlısı budur ki, bu françayzinq müqaviləsi o qədər də şirkətə gəlir gətirmədi və nəticədə, uğursuz oldu (Abbasov, 2005).

Françayzinq tətbiqi cəhətdən iki yerə bölünür: milli françayzinq və beynəlxalq françayzinq. Milli françayzinq müqaviləsi dedikdə, bir ölkə daxilindəki şirkətlə həmin ölkə ərazisindəki digər bir şirkət arasında imzalanan müqavilə nəzərdə tutulur. Beynəlxalq françayzinq isə bir ölkədə yerləşən şirkətlə digər bir ölkə ərazisində yerləşən şirkət arasında imzalanan müqavilədir. Dünyadakı bütün françayzinq müqavilələrinin 16 %-i beynəlxalq səviyyəli müqavilələrdir. Statistikadan da göründüyü kimi, françayzinq müqaviləsi əsasən yerli şirkətlər arasında imzalanır. Son dövrlərdə isə beynəlxalq françayzinq sektoru olduqca sürətlə böyüyür. Françayzinq müqaviləsinin 6 növü var (Soltanova, 2015).

1. Məhsul françayzinqi – ən sıx görülən françayzinq növüdür. Bu françayzinq müqaviləsi zamanı mal və xidmətin istehsalı, paylanması və satış hüququ françayzi tərəfindən françayzerə verilir. Françayzerin fəaliyyət göstərdiyi yerdə françayzinin brendi adı altında yalnız həmin şirkət fəaliyyət göstərir. Bu növ françayzinq ən sıx yayılmış françayzinq müqaviləsidir ki, bu zaman françayer françayzidən məhsul və ya xidmət üçün bütün hüquqları almış olur.
2. İstehsal françayzinqi – bu müqavilə zamanı françayer yalnızca istehsaletmə hüququnu françayzidən almış olur. Məhsulun paylanmasını və satışını bazardakı digər müəssisələr həyata keçirir. Bu müqavilə zamanı françayzer məhsulun ilkin satışından, yəni məhsulu daha sonra alıcıya satacaq şirkətə satışdan gəlir qazanır.
3. Xidmət françayzinqi – bir müəssisənin hər hansısa xidməti təqdimetmə haqqını lisenziya ilə almasıdır. Bu françayzinq müqaviləsi zamanı çıxış edən tərəflər məhz turizm obyektləridir.
4. Master françayzinq – beynəlxalq bazarlarda imzalanan müqavilədir və bu müqavilə zamanı françayzi françayzerə müəyyən bir bölgədə (bu əsasən ölkə olur) onun firma nişanın adı altında çıxış etməsi haqqını verir və bu zaman bütün franşiza haqqını da ona vermiş olur: həm istehsal (və

ya xidmət), həm də satış. Bu, əsasən böyük şirkətlər arasında bağlanan və beynəlxalq səviyyəli müqavilə statusuna malik françayzinq müqaviləsi olaraq qəbul edilir.

5. Satış françayzinqi – müqaviləyə görə françayzer, françayzinin məhsul və ya xidmətlərini satma hüququnu əldə edir ki, bu françayzinq müqaviləsinin ən tipik örnəyidir. Françayzer məhsul və ya xidməti françayzidən ilkin olaraq satın alır və daha sonra onun alıcıya satışından gəlir əldə edir. Bu zaman françayer sanki distribyutor kimi çıxış edir.

6. Onlayn (Online) françayzinq – özəlliklə son dövrlərdə getdikcə məşhurlaşan bir françayzinq müqaviləsi olan onlayn françayzinq müqaviləsində internet mərkəzli platformalar üzərindən şirkətin işlərini şəxslər razılaşılan müqaviləyə uyğun olaraq idarə edir.

Françayzinq sektorunun ana vətəni olan ABŞ-dan bütün dünyaya yayılan françayzinq sektorunda bu ölkənin aparıcı rol oynaması olduqca başa düşüləndir. Bir çox statistik göstərici də, əlbəttə ki, bunu doğrulayır. Bir bənzəri ən cəlbedici 10 françayzinq ölkəsi başlığı altında 2019-cu ildə "Forbes" jurnalında yayımlanan elmi araşdırmanın, 2023-cü ildə eyni başlıq adı altında eyni araşdırma qurumu tərəfindən yayımlanıb. 131 ölkənin bazar həcmi, iqtisadi artımı, satınalma gücü, siyasi və hüquqi durumu Rosenberg Beynəlxalq Françayzinq Mərkəzindəki araşdırmaçılar tərəfindən dəyərləndirilib və bu ölkələr sıralanıb (Cədvəl) (Abdullayeva, 2023).

**Cədvəl.**
**Françayzinq fəaliyyəti üçün ən cəlbedici 10 ölkə**

| Ölkə adı | Cəlbedicilik xalı | Sıralamadakı yeri |
|---|---|---|
| ABŞ | 15.3 | 1 |
| Almaniya Federativ Respublikası | 28.5 | 2 |
| Birləşmiş Krallıq | 29.5 | 3 |
| Avstriya Respublikası | 30.0 | 4 |
| Polşa Respublikası | 32.1 | 5 |
| Kanada | 32.7 | 6 |
| İrlandiya Respublikası | 33.6 | 7 |
| Çin Xalq Respublikası | 33.9 | 8 |
| Fransa Respublikası | 34.1 | 9 |
| Danimarka Krallığı | 36.7 | 10 |

**Mənbə:** *www.paulcollege.unh.edu*

Cədvəldən də qərb ölkələrinin liderliyi açıqca görünür, lakin son zamanlarda ÇXR-nın bu sahədəki yüksəlişinə də diqqət yetirmək lazımdır. Hər nə qədər bu cədvəldə səkkizinci sırada yer almış olsa da, bunun səbəbi çox güman ki, ÇXR-dakı hüquqi məsələlərin yaratmış olduğu çətinlikdir. Sözsüz ki, burada françayzinq müqaviləsinin turizm obyektlərində tətbiq edilməsi üçün kifayət qədər yaxşı şərait var. ÇXR özünə aid olmayan dünyadakı ölkə xaricinə açılmış françayzinqlərin 13 %-nə ev sahibliyi edir və bununla ABŞ-dan sonra ikinci yerdə qərarlaşıb. Françayzinq fəaliyyətinin müasir dövrdəki vəziyyəti sadəcə ABŞ iqtisadiyyatındakı xüsusi çəkisinə baxaraq belə anlamaq mümkündür. Ölkədə fəaliyyət göstərən bütün müəssisələrin 10 %-i françayzinq müqaviləsi şəklində fəaliyyət göstərir. Françayzinq müəssisələri dedikdə, öncə hər kəsin ağlına ilk qidalanma obyektləri (yəni kafe və restoranlar) gəlir. Ümumiyyətlə, françayzinq, əsasən, xidmət sektorunda fəaliyyət göstərən turizm obyektləri arasında bağlanır. Bu da, öz növbəsində, olduca anlaşılandır. Çünki françayzinq şəkildə fəaliyyət göstərən müəssisələrin təkcə 37 %-i məhz qidalanma sektorundakı müəssisələrdir (Bayramlı, 2018).




**Mənbə:** *www.franchisesupermaket.co.uk*

**Qrafik 1.**
**Dünyadakı ən böyük 10 françayzinq müəssisəsi (milyon dollar ilə ifadə olunmuşdur)**

Françayzinq müqaviləsində çıxış edən tərəflər, yəni françayzi və françayzer arasındakı əlaqələr qarşılıqlı fayda (mənfəət) və məsuliyyətlərin paylaşılmasıdır. Onlar arasında müəyyən mövzularda həm fikir birliyi, həm də fikir ayrılığı yaşanan məsələlər, şübhəsiz ki, olacaqdır.

Önəmli olan məsələ bütün bu anlaşmazlıqların françayzinq müqaviləsinin davam etməsinə bir zərər gətirməməsidir. Françayzinq müqaviləsində əsas məsələ françayzi və françayzerin bir-birinin maraqlarını qorumasıdır. Bir digər tərəfdən, əslində, qarşılıqlı fədakarlıq, həmçinin hər iki tərəfin öz məsuliyyət və səlahiyyətlərinə müqaviləyə uyğun olaraq sadiq qalması və bütün bunları pozmamasıdır. Françayzinq müqaviləsi yaradılmış bir sistem içində çalışmağa françayzeri yönəldir. Yəni françayzinq müqaviləsi françayzerə yaradıcı olmağı yox, mövcud sistem çərçivəsində hərəkət etməyi təkid edir. Tərəflər arasındakı yaranan əsas fikir ayrılıqları əsasən bu aşağıdakı sadaladığımız məsələlər ilə bağlı yaşanır. Bunları qısaca nəzərimizdən keçirək (Yeganlı, Hacıyev, 2006).

1. Aparılan reklam kampaniyasının (müxtəlif üsullarla) əhatə etdiyi auditoriya kütləsi.
2. Şaquli qiymətləndirmə siyasəti nəticəsində qaynaqlanan məhdudiyyətlər.
3. Digər fikir ayrılığı isə aparılan bölgələrin bölünməsi (aid olması) üzrə yaşanan anlaşılmazlıqlardır.

Françayzinq müqaviləsini təmsilçilik, distribyutorluq, agentlik və bu kimi sözləşmələrlə qarışdırmaq olmaz. Bunlar tamam ayrı müqavilələr vasitəsi ilə həyata keçirilməkdədir. Françayzinq müqaviləsinin digərlərindən ayırdedici xüsusiyyətləri var. Məsələn, françayzinqdə hər iki tərəfin öz hədəf və mənafeləri vardır. Lakin sözləşmədə hər iki tərəfdə – həm françayzer, həm françayzi ortaq

bir məsələdə gəlir əldə etmək üçün ortaq hərəkət edirlər. Distribyutorluqda isə distribyutorun müstəqil heç bir hədəfi yoxdur, çünki o burada bir ayrı tərəf deyil, əsas şirkətin təmsilçiliyini həyata keçirəndir. Françayzinqdə isə françayzer françayzinin təmsilçisi olsa da, onun öz hədəfləri var və bu onun özünə xidmət edir (Bilalov, 2006).

2023-cü ilin ilk rübündə beynəlxalq səyahət edən turistlərin sayı pandemiya dövründə bütün bir il boyunca səyahət edənlərin 80 %-nə çatıb, bu da tam 235 milyon turist edir. Françayzinq şəklində fəaliyyət kafe və restoran sektorundan sonra ən çox mehmanxana sahəsindədir. Mehmanxana sahəsində françayzinq üsulunu ilk dəfə Hovard Conson (Howard Deering Johnson) 1927-ci ildə istifadə etməyə başlamışdır. O öz adını daşıyan şirkətini (Howard Johnson by Wyndham) bu yolla böyütmüşdür. ABŞ-ın ən önəmli ərazisi olan Kaliforniyada, həmçinin ölkənin həm qərb, həm də şərq sahilləri boyunca öz mehmanxanalarını inşa etmişdir. Hal-hazırda bu şirkətin Şimali Amerika, Cənubi Amerika, Asya qitələri başda olmaqla dünyanın dörd bir tərəfində 460-ın üzərində mehmanxanası françayzinq şəklində öz fəaliyyətinə davam etməkdədir (8).




**Mənbə:** *www.investoopedia.com*

**Qrafik 2.**
**Ən böyük 10 françayzinq otel şəbəkəsi (gəlirinə görə, 100.000 dollar ilə ifadə olunmuşdur)**

Ümumiyyətlə, mehmanxana sektoru turizmin inkişaf etdiyi XX əsrin 60-cı illərində inkişaf etdi və onların sayı getdikcə çoxalmağa başladı. Mehmanxana sənayesində də françayzinq şəklində fəaliyyət göstərən müəssisə, yəni françayzer françayziyə müqaviləyə uyğun olaraq əldə etdiyi gəlirin bir hissəsini ödəyir və bu əsasən gəlirin təxminən 3-4 %-ni təşkil edir. Mehmanxana sahəsində idarəetmənin 3 forması var. *Françayzinq, müqavilə forması* və *icarə yolu ilə.* Mehmanxana sektorunda istisna hallarda françayzinin françayzerə əlavə ödəməli olduğu vəsait olur. Bu mərkəzi bronlaşdırma sistemi varsa, yaşanan bir haldır. Françayzinq sistemi ilə böyüyən

markaların bazardakı payı 78 %-dir. Qalan 22 %-i isə özü təkbaşına filiallarını müxtəlif ərazilərdə açaraq böyüyən markalardır. Bu, françayzinq müqaviləsinin nə qədər geniş yayıldığını göstərir (9).

Təkcə ABŞ-da 2019-cu ildə 759.000-dən çox françayzinq şəklində fəaliyyət göstərən müəssisə ABŞ iqtisadiyyatına 674 milyard dollar kapital qazandırmışdır. Bu, ölkə ərazisində françayzinq fəaliyyətinin kifayət qədər geniş vüsət aldığını göstərir. Eləcə də burada geniş iş imkanları yaradıb. Bu müəssisələrdə 5.6 milyon insan çalışıb ki, bu da, öz növbəsində, kifayət qədər böyük bir rəqəmdir. ABŞ-da 5.100-dən çox françayzi fəaliyyət göstərməkdədir. Bütün bu statistik göstəricilər ABŞ-nın iqtisadiyyatının və ölkədəki françayzinq sahəsinin gücünün gözəl bir xatırladıcısıdır (10).

Türkiyə Respublikasında isə 3.700 françayzinq şəklində fəaliyyət göstərən markanın 66.000-dən çox müəssisəsi var. Bunların 24 %-i xarici, geri qalan 76 %-i isə Türkiyə mərkəzli markalardır. Bu müəssisələrdə 250.000-dən çox insan çalışır ki, bu rəqəm ölkədəki bütün məşğul əhalinin 2 %-nə bərabərdir. 2022-ci ilin sonunda Türkiyə Respublikasında françayzinq sektoru 55 milyard dollarlıq bir bazar halına gələcəyi gözlənilirdi ki, bu təxminən belə də oldu. Bu olduqca böyük bir rəqəmdir və françayzinq sektorunun ölkədə nə qədər inkişaf etdiyini göstərir. Heç də təsadüfi deyil, çünki ölkə dünyadakı ən böyük turizm destinasiyalarından biridir və bir çox xarici şirkətlər burada fəaliyyət göstərmək üçün can atırlar. Lakin az əvvəlki statistikadan da gördük ki, respublikada fəaliyyət göstərən şirkətlərin böyük bir hissəsi məhz yerli şirkətlərdir. Bu da yerli françayzinqin ölkədə inkişaf etdiyinin olduqca vacib bir göstəricisidir. Türkiyəyə 2023-cü ildə 56 milyondan çox turist gəlib. Məhz bu da ölkənin turizm imicinin nə qədər güclü olduğunu göstərir. Turizm sekrorunun belə inkişaf etməsi də xarici françayzilərin ölkədəki turizm obyektləri ilə əməkdaşlıq və ölkəyə yatırım etməsinə təşviq edir. ABŞ-dakı françayzinq sektorundakı vəziyyət haqqında məlumat sahibi olduqdan sonra Avropadakı vəziyyətə baxaq. Qitədə 13.500 françayzinq markasının 700.000 müəssisəsi fəaliyyət göstərir (11; International Recommendations for Tourism Statistics, 2008).

## Nəticə

Ölkə müstəqillik əldə etdikdən sonra öz iqtisadiyyatını qurmağa və tədricən şaxələndirməyə başladı. Təbii resursların satışından gəlir əldə edən respublika üçün prioritet sahələrdən biri məhz turizm sektorudur. Bu sektorun inkişaf etdirilməsi üçün hökumət bir sıra tədbirlər həyata keçirtdi. Turizm sektorunun inkişafı üçün turizm obyektlərinin varlığı və onların azad bazar şəraitində rəqabət halında olması isə danılmaz bir həqiqətdir. Turizm obyektlərinin sayının artması, daim rəqabət halında olması və sektorun inkişafı üçün françayzinq sahəsinin inkişafı gərəklidir. Bizə yetərincə aydındır ki, françayzinq sektoru hər il getdikcə daha da sürətlə inkişaf edən bir sektor halına gəlib. Hər il təxmini olaraq 5 % françayzinq sekorunun xüsusi çəkisi dünya bazarında artmaqdadır.

Əgər hər hansısa bir dövlət turizm sahəsini inkişaf etdirmək istəyirsə, bu sektora diqqət yerirməsi vacibdir. Françayzinq sektoru yarandığı dövrdən davamlı və dayanıqlı bir inkişaf yolu keçmiş, dünya iqtisadiyyatında hər keçən gün öz önəmini daha da artırmışdır. Hər bir sahibkar, şübhəsiz ki, bu müqavilənin önəmini qavramalı və düzgün bir biznes qurmaq üçün lazımi addımları atmalıdır. Əgər sahibkar biznesini qısa bir müddət ərzində qurmaq və genişləndirmək istəyirsə, o zaman françayzinq müqaviləsindən istifadə etməlidir. Çünki bu kommersiya müqaviləsi françayzerə hərtərəfli yardım edir. Biznesin ölkədəki inkişafı üçün dövlət bir sıra addımlar atmalıdır. Bunların başında isə maarifləndirmə işi aparılmalıdır.

Zənnimcə, dövlət sahibkarları biznes sektorunun inkişafı üçün françayzinq sektoru haqqında müxtəlif üsullarla mütəmadi olaraq məlumatlandırmalıdır. Bunun başında, şübhəsiz ki, bu sahədə dərnəklərin, assosiasiyaların qurulması gəlir. Bu cür qurumlar dövlət qurumları ilə qarşılıqlı dəstək ilə hərəkət etməlidirlər. Sektorun inkişafı üçün bir sıra xarici qurumlarla əməkdaşlıq etmək kifayət qədər faydalı olacaqdır. Françayzinq sektorunun inkişafı qarşısındakı ən böyük əngəllərdən biri bazarda hərəkətin istənilən səviyyədə azad olmaması, yəni inhisarçılığın olması, sahibkarların bu mövzu ilə bağlı yetərincə məlumat sahibi olmaması, bankların öz biznesini qurmaq istəyən şəxslərə biznes kreditlərinin verilməsində istəkli olmaması, turizm obyektlərinin təklif etdiyi məhsul və xidmətin keyfiyyətinə nəzarət edəcək və onun keyfiyyətini artırmaq üçün tədbirlər həyata keçirəcək

qurumun olmaması, zənnimcə, bu sahədəki inkişafın qarşısında duran ən böyük problemlərdəndir. Xüsusilə bölgələrdə yeni turizm obyektlərinin yaranması, turizm sektorunun inkişafı üçün gərəklidir. Çünki turizm obyektlərinin məhz 70 %-i paytaxt Bakı şəhərindədir. Bunun üçün də az əvvəl sadaladığımız problemlərin həll edilməsi ilə yanaşı, bölgələrdə quruculuq işləri də aparılmalıdır ki, sahibkarlar buna maraq göstərsinlər. Françayzinq sektorunun inkişafı yeni iş yerlərinin açılması, dövlətin gəlirlərinin artması, sektordakı rəqabətin olması, iqtisadi faydanın təmin olunması üçün vacibdir. Françayzinq sektoru dünyanın aparıcı ölkələrində inkişaf edib və bu ölkələr sektorda daimi olaraq yeniliklərə açıqdır. Bu ölkələrin zəngin təcrübələrindən yararlanmaq olduqca önəmlidir.

## Ədəbiyyat

1. Bilalov, B. Ə., Gülalıyev, Ç. (2015). Turizmin əsasları. Bakı.
2. Abbasov, A. B. (2005). Biznesin əsasları. Bakı.
3. Soltanova, H. (2015). Azərbaycan Respublikasında turizm və onun inkişafı. Bakı.
4. Abdullayeva, G. (2023). Azərbaycanda ekoloji turizmin inkişafı. Turan-Sam, s. 15.
5. Bayramlı, Q. (2018). Azərbaycanda turizmin dayanıqlı inkişaf perspektivləri. Azərbaycan Universiteti.
6. Yeganlı, S., Hacıyev, E. (2006). Turizm. Bakı.
7. Bilalov, B. (2006). Turizm fəaliyyətinin tənzimlənməsi. Bakı.
8. Oztash, K., Karabulut, T. Tourism economy, general tourism information.
9. Kırca, Ch. Franchise agreement. Lecturer at Ankara University, Faculty of Law, Department of Civil Law.
10. Yeniocak, U. Franchise agreement.
11. Blair, R. D. The economics of franchising.
12. International Recommendations for Tourism Statistics. (2008). Glossary of terms.

Göndərilib: 20.04.2024 Qəbul edilib: 10.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/83-89

**Gunel Nabizade**
Baku State University
master student
nebizade.gunel2000@gmail.com

# NAVIGATING ENERGY DISPUTES: INSIGHTS INTO THE ENERGY CHARTER TREATY AND ALTERNATIVE RESOLUTION METHODS

**Abstract**

This article first takes a closer look at the historical and economic processes that underpinned the Energy Charter Treaty. After a brief examination of the Energy Charter Treaty, dispute resolution methods of the Treaty are studied, and especially the resolution of investment-related disputes is explored. One of the inevitable phenomena of the interaction of trade forces is disputes, which is analyzed in the study. The global energy industry is no exception. The global energy industry is arguably the most controversial industry in international business. Therefore, since the results can be very negative, there is a need for mechanisms to eliminate errors. It is established and substantiated that the law addresses these issues through energy dispute resolution mechanisms and codifications incorporated into various international and municipal energy treaties and laws. An important reason for the emergence of alternative dispute resolution methods and this system is that the court service provided by the state through courts is a time-consuming and economically profitable method. In other words, the desire of the parties to resolve disputes quickly and on their own initiative has led to the emergence of alternative dispute resolution methods. All over the world, even in the least developed countries, the burden imposed by legal systems and commercial transactions, and the difficulties faced by courts in managing this burden, result in the need for a faster and more satisfactory method of arbitration for parties to legal and commercial disputes. Based on the study, it is suggested that the energy charter agreements and other international energy agreements should be strengthened with dispute resolution mechanisms. These mechanisms can increase confidence in the industry and ensure the continuity of trade by providing a quick, effective and fair solution to the parties. Therefore, the establishment of alternative dispute resolution methods specifically designed and adapted for the parties in the energy sector can be recommended. This can provide a more effective and cost-effective way to resolve disputes that parties in the industry may face.

***Keywords:*** *Energy Charter Treaty, arbitration, investment, public service concession agreement, energy industry*

**Günel Nəbizadə**
Bakı Dövlət Universiteti
magistrant
nebizade.gunel2000@gmail.com

## Enerji mübahisələrinin naviqasiyası: enerji xartiyası müqaviləsinə və alternativ həll metodlarına münasibətlər

**Xülasə**

Məqalədə, ilk növbədə, Enerji Xartiyası Müqaviləsinin əsasını təşkil edən tarixi və iqtisadi proseslərə daha yaxından nəzər salınır. Enerji Xartiyası Müqaviləsi qısaca araşdırıldıqdan sonra müqavilənin mübahisələrin həlli üsulları öyrənilmiş və xüsusilə investisiya ilə bağlı mübahisələrin həlli tədqiq olunur. Ticarət qüvvələrinin qarşılıqlı təsirinin qaçılmaz hadisələrindən biri mübahisələrdir ki, onlar da tədqiqatda təhlil edilir. Qlobal enerji sənayesi də istisna deyil. Qlobal enerji sənayesi, şübhəsiz ki, beynəlxalq biznesdə ən mübahisəli sənaye kimi qeyd edilir. Buna görə

də nəticələr çox mənfi ola biləcəyi təqdirdə səhvləri aradan qaldırmaq üçün mexanizmlərə ehtiyac yaranır. Qanunun bu məsələləri enerji mübahisələrinin həlli mexanizmləri ilə müxtəlif beynəlxalq, bələdiyyə enerji müqavilələri və qanunlarına daxil edilmiş kodifikasiyalarla həll etdiyi müəyyən edilir və əsaslandırılır. Mübahisələrin alternativ həlli üsullarının və bu sistemin yaranmasının mühüm səbəbi dövlətin məhkəmələr vasitəsilə göstərdiyi məhkəmə xidmətinin vaxt aparan və iqtisadi cəhətdən sərfəli üsul olmasıdır. Başqa sözlə, tərəflərin mübahisələri tez və öz təşəbbüsü ilə həll etmək istəyi mübahisələrin alternativ həlli üsullarının yaranmasına səbəb olmuşdur. Bütün dünyada, hətta ən zəif inkişaf etmiş ölkələrdə belə, hüquq sistemlərinin və kommersiya əməliyyatlarının tətbiq etdiyi yük və bu yükün idarə olunmasında məhkəmələrin yaşadığı çətinliklər hüquqi və kommersiya mübahisələrinin tərəfləri üçün daha sürətli və qənaətbəxş arbitraj metodunun zəruri olması nəticəsinə gəlinir. Tədqiqat əsasında təklif edilir ki, enerji xartiyası sazişlərinin və digər beynəlxalq enerji sazişlərinin mübahisələrin həlli mexanizmləri ilə gücləndirilməsinin vacibliyi irəli sürülsün. Bu mexanizmlər tərəflərə sürətli, effektiv və ədalətli həll yolu təqdim edərək sənayeyə olan inamı artıra və ticarətin davamlılığını təmin edə bilər. Buna görə də enerji sektorunda tərəflər üçün xüsusi olaraq hazırlanmış və uyğunlaşdırılmış alternativ mübahisələrin həlli üsullarının yaradılması tövsiyə oluna bilər. Bu, sənayedəki tərəflərin üzləşə biləcəyi mübahisələri həll etmək üçün daha effektiv və sərfəli üsul təmin edə bilər.

***Açar sözlər:*** *Enerji Xartiyası Müqaviləsi, arbitraj, investisiya, dövlət xidməti konsessiya müqaviləsi, enerji sənayesi*

## Introduction

In the energy sector, one of the sectors where the effects of globalization are felt most, the search for cooperation has accelerated, especially with the end of the Cold War and the dissolution of the Union of Soviet Socialist Republics (USSR). Cooperation efforts between the former Soviet Union countries, which are rich in energy resources but limited in investment resources, and developed European countries, which are poor in energy resources but rich in investment resources, were first mentioned at the meetings of the European Council in Dublin in 1990 and the first official studies began. has been started. The road map on this issue was determined with the European Energy Declaration published in 1991. Finally, these efforts bore fruit with the Energy Charter Agreement signed in 1994, and a comprehensive and multilateral agreement was reached for the first time in the energy sector.

The shaping of the EU's energy policy started with the European Coal and Steel Community, which was established with the Paris Agreement of 1951, which formed the basis of the Union; It gained momentum with the signing of the agreements establishing the European Atomic Energy Community and the European Economic Community in 1958. In the 1960s, 60 percent of energy demand was met by coal, while the share of oil was only ten percent. During these dates, various directives were published and some protocols were signed in order to create a common energy policy. The oil crisis in the 1970s made it necessary for the Union to create a new energy strategy, and the European Council adopted the "New Energy Policy Strategy" in 1974, which envisaged reducing energy consumption, ensuring supply security and protecting the environment in the production and consumption processes of energy. has adopted a policy (Ilhan, 2004: 26). In the 1980s, efforts to establish a single market and liberalization in the energy sector gained importance. However, due to the dependence of electricity and natural gas on relatively new developing technologies and their transportation and distribution being dependent on networks, free circulation in these sectors occurred later, and both energy sectors remained dependent on national markets for decades.

The end of the Cold War in the early 1990s and the emergence of independent states rich in energy resources gave rise to the idea of cooperation between EU countries poor in energy resources and newly independent states with limited investment opportunities (Andrew, 1998: 435). At the meeting of the European Council in Dublin in 1990, the Netherlands stated that the economic development in Eastern Europe and Russia would gain momentum with the cooperation

in the energy sector, and with the acceptance of this opinion by the Council, studies were carried out on how to carry out this cooperation (Bilgin, 2007: 336). In February 1991, the European Community Commission proposed the concept of the "European Energy Charter" and in the same year, to start EU negotiations, it included all Western and Eastern European countries, the not yet dissolved USSR and the non-European Organization for Economic Co-operation and Development (OECD). invited their countries to the conference held in Brussels. The USA, Canada, Australia and Japan also joined the conference shortly afterwards. Finally, on 17 December 1991, almost at the same time as the dissolution of the USSR, the European Energy Charter Declaration (ECSC) was signed in The Hague by 38 states and the EU, including Turkey and the USA (Bilgin, 2007: 55), and a political framework aimed at ensuring cooperation in the energy sector. It emerged as a statement of intent. No binding international agreement has been signed between the parties. ESC has currently been signed by 58 states and continues to exist as a mandatory stage for the signing of ECA.

**Insights into the Energy Charter Treaty and Alternative Resolution Methods**

ECA was originally developed on the basis of the 1991 ESC. With the signing of the ESC, the preparatory work for a binding international agreement text began, and as a result of these studies, the ESC, which will create the necessary legal infrastructure for international cooperation in the energy sector, was opened for signature in Lisbon on 17 December 1994. ECA is the first comprehensive and multilateral international agreement regulating the rights and obligations of actors playing a role in the energy sector in areas such as investment, trade, energy transportation, environment, competition, market entry, technology transfer, efficient use of energy and dispute resolution. It has currently been signed by 51 countries, including Turkey, as well as the EU and the European Atomic Energy Community, and came into force on 16.04.1998. 23 countries, including the USA and Canada, and 10 international organizations, which have signed the AESD, still have observer status. Although the Russian Federation signed the ECA on 17.12.1994, it declared on 20.08.2009 that it would not ratify the ECA and would not be a party, especially in order not to lose its monopoly power in the field of energy and to increase investment opportunities with its own resources (4).

Since the trade-related provisions of the ECA were signed before the Marrakesh Agreement of 1994, which established the World Trade Organization (WTO), the trade provisions included in "The General Agreement on Tariffs and Trade" (GATT) signed in 1947. In addition, with these amendments, the scope of the ISA was expanded to include energy-related equipment and the energy materials, products and services of Azerbaijan, Belarus, Bosnia and Herzegovina, Kazakhstan, Tajikistan, Turkmenistan and Uzbekistan, which are parties to the ISA but not yet members of the WTO, By taking energy-related equipment as a reference, the way was opened for them to become familiar with WTO practices and disciplines.

Consisting of eight chapters, fifty articles and many annexes, ECA does not aim to determine national energy policies or finance investments in energy producing countries, nor does it provide any recommendations or obligations for opening energy networks to third parties. We can say that two basic understandings played a role in signing the ECA. Firstly, the importance of the energy sector in revitalizing the economies of Central and Eastern European countries, which are in the transition phase to a liberal system, is understood. Secondly, developed Western European countries understand that they need to find alternatives to the insecurity of the North Sea, Middle East and North African resources from which they obtain the energy they need, and therefore they consider supply security as the main problem (Kolosov, 1971: 514). While some headings, such as investment and energy transit, are regulated with stricter rules, some headings are subject to more flexible and non-binding rules; From time to time, in some titles, strict and flexible rules are included in a way that complement each other (Kolosov, 1971: 438). Apart from these, other technical agreements are also frequently referred to in the ECA.

The conference is authorized to establish subordinate bodies to carry out its duties. In this context, the Energy Efficiency Group, Investment Group, Trade Group and Transit Group were

established and these groups have a regular work program. The Budget Committee and the Legal Advisory Committee do not have a regular work schedule, but they work under the Conference (Aliyev, 2011: 24).

The contracting party or its competition authority that receives the notification examines the situation and, if deemed necessary, exchanges information with the competition authority of the notifying contracting party, decides whether any measures need to be taken, and notifies the notifying contracting party with its reasons for its decision. If the decision is that a measure should be taken, the notifying party will also inform the contracting party of the measures taken and developments (Sadigov, 2008: 160).

*Investment-Related Disputes*

There is no agreed upon definition of the concept of investment. In the legislation and scientific works, such a definition is avoided due to the concern that the definition will not be able to cover all investment types. For this reason, in agreements regarding the protection of investments, investment is generally not defined, but assets and rights that can be considered as investments are listed (Arzu, 2009: 170).

ECA, which is an international agreement, also preferred a similar method and instead of defining the concepts of investment and investor, it chose to specify the assets that will be considered as investments. Accordingly, all kinds of property rights, such as real or in-kind, movable and immovable assets and mortgages, liens and guarantees; a company or enterprise, or shares, bonds or other forms of participation in a company or enterprise, promissory notes and debts of a company or enterprise; claims for money and performance of services that have an economic value and are related to a contract for an investment; intellectual property; earning; Rights granted based on laws, contracts or licenses and permits issued in accordance with the laws regarding any economic activity initiative in the energy sector are considered within the scope of investment (Bilgin, 2007: 36).

Considering these issues, states undertake to each other to protect foreign investment and investors by making bilateral or multilateral agreements aiming at the protection and promotion of foreign investments. However, these agreements have always been a matter of controversy because they limit the state's sovereign rights to a certain extent (Ercument, 2009: 24).

Article 10 of the ECA is titled "Promotion, Protection and Implementations of Investments" and does not foresee clearly defined obligations for the protection and promotion of investments, but only sets basic standards. According to the first paragraph of the said article, the Agreement parties are obliged to establish stable, fair, appropriate and transparent conditions for investors of other Agreement parties to invest in their own countries. In addition, the Agreement parties undertake to provide equal and fair treatment to the investments of other Agreement parties. This provision emerged from the OECD investment contract models and was taken as a basis by NAFTA in many decisions. Furthermore, investments shall enjoy stable and continuing protection and security, and no Contracting Party shall act in a manner that creates inequality in the management, maintenance, benefit, right of use or transfer of investments by unreasonable or discriminatory measures. In no case shall such investments be subject to procedures less than those imposed by international law, including Treaty obligations (10).

Article 11 of the ECA regulates that the Agreement parties are obliged to examine in good faith the requests of investors of other Agreement parties and key personnel appointed by these investors to enter their own countries for investment activities. In addition, the parties to the Agreement will allow the appointment of a key personnel for investors with investments in their countries or for their investments, regardless of nationality and citizenship status (James, 2006).

Article 13 of the agreement regulates the protection of investors against expropriation, nationalization or transactions that will result in similar results, which is an important issue and a fundamental risk for investments in the energy sector. According to the said article, if a Contracting Party wishes to expropriate the investments of another Contracting Party, it must do so for a purpose in the public interest, without discrimination, in a completely lawful manner and by

providing adequate compensation in a timely manner. When determining the expropriation value, the value before the expropriation process (if the issue of expropriation has affected the value of the investment, the value before it is affected) should be taken into account. Commercial interest will also accrue for the period until the payment date, and payment must be made in convertible currency. These provisions will also be applicable if the foreign investor owns shares (Cengiz, 2002).

The resolution method regulated in Article 26 of the ECA is applied to investment-related disputes involving the claims of the Agreement party investor that the obligations in the third part of the Agreement have been violated by the Invested Agreement party state. The third part of the agreement contains many vague obligations and its scope is very broad; However, the absence of strict obligations for the pre-investment stage relatively eliminates these drawbacks. It is not possible to apply this provision in other disputes arising from provisions other than the third part of the agreement (Cemal, 2002).

For the resolution of investment disputes, the investor can apply to the International Center for the Settlement of Investment Disputes (ICSID) established in accordance with the "Convention on the Settlement of Investment Disputes Occurring Between States and Nationals of Other States" dated 1965 and ICSID arbitration within this scope. ICSID arbitration, an institutional arbitration, specializes in investment and operates under the World Bank (Salih, 2007: 243). It was established by an international agreement and a self-governing system was created, independent of domestic law. Decisions made as a result of ICSID arbitration are final, just like the decisions of the courts of the states whose enforcement is sought.

In order to apply for ICSID arbitration, as a rule, the state of the investor, which is a party to the investment dispute, and the state of the investment must sign the ICSID Convention. However, the "ICSID Conciliation and Arbitration Additional Mechanism Rules" were accepted in 1978 and the way for arbitration was opened even if only one of the parties was a party to the ICSID Convention. This arbitration, which is carried out in accordance with the additional mechanism rules, is carried out by the ICSID Secretariat and is not technically an ICSID arbitration (Craig, Jan, Thomas, 2000: 33).

United Nations Commission on International Trade Law (UNCITRAL) arbitration rules, which are widely adopted and used around the world, are designed to be used in ad hoc arbitration and consist of rules that are applicable to almost all types of ad hoc arbitration. It is not an institutional type of arbitration and is not monitored, supervised or managed by a specific institution. These rules were created by the United Nations (UN) Commission on International Trade Law in 1976 to ensure that those who prefer ad hoc arbitration can carry out arbitration procedures within the framework of international rules without being subject to local arbitration regulations.

The third international arbitration institution to which the investor can apply under the ECA is the arbitration of the Arbitration Institute of the Stockholm Chamber of Commerce (SCC Arbitration Institute). SCC Arbitration Institute was established in 1917 and is an institutional arbitration institution widely used to resolve disputes arising from commercial and economic contracts between the East and West bloc through arbitration, especially during the Soviet Union. It has a legal entity independent from the chamber and the arbitration rules revised in 1999 are applied. Here, the substantive law rules deemed appropriate by the parties are applied, and if the substantive law rule is not chosen by the parties, the law to be applied is determined by the arbitral tribunal.

In accordance with the fifth paragraph of the article, it is stipulated that arbitral awards arising from investment disputes will be enforced in accordance with the United Nations Convention on the Recognition and Enforcement of Foreign Arbitral Awards signed in New York in 1958. The agreement in question applies only to arbitral decisions arising from commercial relations. For this reason, the ECA accepted that all arbitration claims arise from commercial relations and made it possible for these claims to be subject to the United Nations Convention on the Recognition and Enforcement of Foreign Arbitral Awards (Feyiz, 2004: 15). In accordance with the provisions of the

Washington Convention, since the parties agree that the arbitral decisions are binding and enforceable, resorting to ICSID arbitration is in the favor of the parties.

## Conclusion

In ECA, which constitutes the multilateral legal structure in international energy cooperation; Basically, issues concerning investment, trade, transit, competition and environment in the energy sector are regulated. With its comprehensive structure, it aims to encourage and facilitate international energy cooperation. The agreement recognizes state sovereignty over national resources and also attempts to help improve energy supply security, which is of vital importance for Europe. Ensuring energy security through the functioning of an open and competitive energy market through ECA; protecting the investor based on the principles of national treatment or most favored nation registration; to protect investors against non-commercial legal and political risks; trade on terms based on WTO rules; to resolve disputes between contracting states and between investors and host states; The aim is to support energy efficiency and try to minimize the environmental impacts of energy production and use.

Although ECA regulates trade, competition, environment and energy efficiency problems and relations in the energy sector, its most important pillars are investments and investor protection. In this context, the provisions regarding the protection of investors and the resolution of investment disputes are regulated in detail in the ECA. "Giving the investor the right to go to international arbitration for the resolution of investment disputes", adopted in the resolution of investment disputes, is an important right envisaged to minimize legal risks and costs in investment.

## References

1. Ilhan, Y. (2004). Settlement of International Investment Disputes through Arbitration and ICSID. Istanbul, p. 33.
2. Andrew, T. (1998). The Energy Charter Treaty and “Compulsory” International State/Investor Arbitration. Leiden Journal of International Law, I. 11, p. 513-526.
3. Bilgin, T. (2007). The Relationship Between Investments and International Arbitration: ICSID Arbitration. International Economy and Foreign Trade Policy, 1(2), p. 170.
4. International Financial Organizations and Azerbaijan. (2016). Textbook. Baku: "Zardabi-Nashr" LLC Publishing Printing Enterprise, 268 p.
5. Kolosov, Yu. M. (1971). Dogovornaya initsiativa v mezhdunarodnykh otnosheniyakh. Gosudarstvo i pravo, № 12, s. 21-24, 33. Dogovor, uchrezhdayushchiy yevropeyskoye soobshchestvo (konsolidirovannyy tekst s uchotom Nitstsskikh izmeneniy). http://eulaw.edu.ru
6. Aliyev, E. A. (2011). International economic law: general provisions. Baku: "Legal literature" Publishing House, 240 p.
7. Sadigov, A. I. (2008). International economic law: a textbook. Baku: Baku University Publishing House, 396 p.
8. Arzu, Y. (2009). European Union's Energy Policy and Effects on Turkey. Information Strategy, V. 1, I.1, Autumn, p. 26.
9. Ercument, E. (2009). Energy Charter Treaty/Framework I-II Dispute Settlement. http://www.globalenerji.com.tr/yaz140- 230003-24,62@2300.html
10. Esra, D. http://www.mfa.gov.tr/enerji-sarti-anlasmasi.tr.mfa
11. James, Ch. (2006). Making the Investment Provisions of the Energy Charter Treaty Sustainable Development Friendly. International Environmental Agreements, p. 435.
12. Cengiz, G. (2002). Energy and Infrastructure Investment Models Applications and Legislation in All Aspects. Ankara.
13. Cemal, Sh. (2002). Drafting of International Trade Agreements and Dispute Resolution Methods. Istanbul, p. 243.
14. Salih, T. (2007). Enforcement of Arbitral Awards in ICSID Arbitration. Izmir, p. 55.

Vergitutmanın qanuniliyi prinsipinin digər xüsusiyyətlərindən biri də burada iradə azadlığına və tərəflərin razılığına yer verilməməsidir. Belə ki, vergi öhdəliyinin qoyulması, götürülməsi və ya dəyişdirilməsi tərəflərin iradəsindən və razılığından asılı deyil. Konstitusiyanın 73-cü maddəsində təsbit olunmuş müddəaya əsasən, "vergi ödəmək vəzifəsi dövlətin şərtsiz tələbi kimi bütün vergi ödəyicilərinə şamil olunur" (8).

Konstitusiya Məhkəməsi Plenum qərarında qeyd edir ki, "vergi ödəyicisinin bu vəzifəsində cəmiyyətin bütün üzvlərinin ictimai maraqları öz əksini tapmışdır. Buna görə dövlət yalnız vergi ödəyicilərinin deyil, həmçinin cəmiyyətin digər üzvlərinin də hüquq və qanuni mənafelərinin qorunması məqsədilə vergi hüquq münasibətlərini tənzimləmək sahəsində qanuni tədbirlər görmək hüququna və vəzifələrinə malikdir. Vergi hüquq münasibətləri bir tərəfin digər tərəfin hakimiyyəti tabeliyində olmasına əsaslanır. Bu münasibətlər dövlətin adından fəaliyyət göstərən bir tərəfin – vergi orqanının hakimiyyət səlahiyyətlərinə malik olmasına, digər tərəfin – vergi ödəyicisinin isə tabeçiliyinə əsaslanan tərəflərin subordinasiyasını nəzərdə tutur. Xüsusilə qeyd olunmalıdır ki, vergi orqanının tələbləri və vergi ödəyicisinin öhdəlikləri müqavilədən deyil, qanundan irəli gəlir".

**Avropa hüququnda vergitutmanın qanuniliyi prinsipinin təsbiti**

Milli hüquq sistemimizdəki vergitutmanın qanuniliyi prinsipini daha yaxşı başa düşmək və təkmilləşdirmək məqsədilə vergitutmanın tətbiqi ilə bağlı Avropa reallığını müşahidə etmək və dünya rifahı idealını nəzərdən keçirmək yerinə düşərdi. Ona görə ki xarici hüquq sistemlərində "bilik axtarışı" hüquqşünasın milli hüquqla xarici hüququ müqayisə edərək onun özünəməxsus xüsusiyyətlərini daha aydın görməsinə imkan verir. Beynəlxalq səviyyədə vergitutmanın qanuniliyi prinsipi bütün üzv dövlətlər tərəfindən ratifikasiya olunmuş "İnsan hüquqlarının və əsas azadlıqların müdafiəsi haqqında" Konvensiyanın (1952) 1 saylı Protokolunun 1-ci Maddəsi ilə bağlı məhkəmə qərarlarından çıxarıla bilər.

Bu xüsusda Konvesiyanın 1 saylı Protokolunun 1-ci maddəsində qeyd olunur ki: *"hər bir fiziki və hüquqi şəxs öz mülkiyyətindən maneəsiz istifadə hüququna malikdir. Heç kəs cəmiyyətin maraqları naminə qanunla və beynəlxalq hüququn ümumi prinsipləri ilə nəzərdə tutulmuş şərtlər istisna olmaqla, öz mülkiyyətindən məhrum edilə bilməz".*

Bu baxımdan, Avropa İnsan Hüquqları Məhkəməsinin presedent hüququna uyğun olaraq, dövlətin mülkiyyətə hörmət hüququna müdaxiləsi üçün hüquqi əsas kimi xidmət edən milli normalar kifayət qədər "əlçatan", "dəqiq" və "gözlənilən" olmalıdır. Əslində, AİHM yalnız bildirir ki, müvafiq hüquqi baza qanunun aliliyi prinsipinə uyğun olmalı və dövlət orqanlarının özbaşına müdaxiləsinə qarşı adekvat təminatlar, o cümlədən prosessual təminatlar müəyyən etməlidir.

Bir çox Avropa dövlətlərinin milli hüququna nəzər salsaq görərik ki, vergitutmanın qanuniliyi prinsipi birbaşa onların Konstitusiya aktlarında öz əksini tapmışdır (İspaniya (9), Fransa (10), Belçika (11), Danimarka (12)).

Bəzi dövlətlərdə bu prinsip məhkəmə presedenti əsasında digər konstitusion prinsiplərin birlikdə (qanunçuluq, qanunun aliliyi, şəxsi azadlıq) şərhi ilə formalaşmışdır (məs, Almaniya (13)).

İstisna olaraq bəzi dövlətlər vergitutmanın qanuniliyi prinsipini yalnız öz üzvi qanunlarında (Macarıstan) və ya xüsusi qanunlarında (Latviya) açıq şəkildə təsbit edirlər. Vergitutma prosesi yalnız qanunlarla deyil, eyni zamanda vergi hüququnun digər mənbələrinin müəyyən etdiyi "qaydalarla" da tənzimlənir. Vergi ödəyiciləri isə məhz bu qaydaların tətbiqi zamanı ortaya çıxan inzibati hərəkətlərlə qarşılaşırlar. Buradan sual yaranır ki, vergitutmanın qanuniliyi prinsipinə əməl edilməsi üçün vergi qanunlarından nə dərəcədə müfəssəl tənzimləmə gözlənilir? Hansı məsələlər yalnız qanunla tənzimlənməlidir?

Avropa İttifaqının Ədalət Məhkəməsinə görə, vergitutmanın qanuniliyi prinsipi hər hansı vergi öhdəliyinin və verginin fundamental xüsusiyyətlərini müəyyən edən elementlərin qanunla müəyyən olunmasını tələb edir. Lakin vergitutmanın texniki tərəfləri qanunla müəyyən edilməyə də bilər.

Bəzi Avropa dövlətlərin Konstitusiyaları və ya buna bərabər hüquqi aktları vergilərin yalnız bəzi elementlərinin qanunla tənzimlənməli olduğunu müəyyən edir. Məsələn, Fransada vergi bazası, vergi dərəcələri və bütün növ vergilərin toplanması üsulları, Yunanıstanda vergiyə cəlb edilməli olan gəlir və şəxslər, aktivlər, xərclər, əqdlər (14), Portuqaliyada vergi bazası, vergi dərəcələri,

vergi güzəştləri, təminatlar, vergilərin toplanması və hesablanması (15), Bolqarıstanda vergidən azadolmalar və ya vergi dərəcələrinin artırılması qanunla tənzimlənməlidir (16).

**Vergilərin müəyyən edilməsi səlahiyyətinin ötürülməsi**

Göründüyü kimi, Avropa ittifaqının üzv dövlətləri obyektiv olaraq vergilərlə bağlı bütün qaydaların vahid qanunda toplanmasının mümkün olmaması məsələsi ilə razıdırlar. Araşdırılan bir çox qanunvericilik aktlarında, prinsip etibarilə, vergi qanunlarının qanunverici orqan tərəfindən qəbul edilməli olması prinsipi tanınsa da, icra hakimiyyəti orqanının vergilərin bəzi spesifik və texniki elementlərini müəyyən etməsi məqbul sayılır. Hesab olunur ki, icra hakimiyyəti orqanının aktlarında yalnız qanunla müəyyən edilmiş məsələlər üzrə əlavə qaydalar müəyyən edilə bilər. Beləliklə, icra orqanı yeni növ vergilər yarada bilməz.

Avropa kontinetnal hüququnda icra hakimiyyətinin vergi qanunlarının icrası ilə bağlı qaydalar müəyyən etmək səlahiyyəti vardır, bir şərtlə ki, parlamentin qəbul etdiyi qanun verginin əsas elementlərini müəyyən edən kifayət qədər xüsusi normalar nəzərdə tutur. Bu o deməkdir ki, parlamentin aktında vergi ödəyicisini, vergi obyektini, vergitutma bazasını, vergi dərəcələrini və verginin tutulması qaydalarını müəyyən edən normalar olmalıdır. İcra hakimiyyəti orqanının vergi qanunlarını icra etmək və ya həyata keçirmək səlahiyyəti konstitusiyada ümumi və ya xüsusi səlahiyyətlərin ötürülməsinə əsaslanır. Bu cür səlahiyyətlərin verilməsi ilə müəyyən edilən vergi qaydaları qanunun özünün icrası ilə məhdudlaşır və yalnız həmin qanunlar çərçivəsində qüvvədədir. İcra orqanının qərarları ilə idarəetmə və prosedur məsələləri müəyyən edilə bilər. Vergi qanununun əhatə dairəsini genişləndirən, onun şərtlərini və ya qanunun mənasını dəyişdirən qaydalar məhkəmə tərəfindən qanunsuz elan oluna bilər.

Müstəsna və çox məhdud hallarda qanunverici vergi qanunlarını və ya vergilərin mühüm elementlərini müəyyən etmək üçün icra hakimiyyətinə tam səlahiyyət verə bilər. Belə səlahiyyətlərin verilməsi konstitusiyada xüsusi olaraq nəzərdə tutula bilər. Belə hallarda çox zaman qəbul edilən aktın parlament aktı ilə post-faktum ratifikasiyası tələb edilir.

Qeyd etdiyimiz kimi, AR Konstitusiyasının 73-cü maddəsi vergi hüququ üçün yalnız konstitusion prinsiplər çərçivəsini müəyyən etmişdir. Bu hal təbiidir, çünki kontitusion prinsiplər əsas etibarilə qurucu və qoruyucudur. Həddən artıq detallı (təfərrüatlı) Konstitusiya dəyişən tələblərə cavab verməyə bilər.

AR Konstitusiyası vergilərin müəyyən edilməsi zamanı onun yalnız "əsas" elementlərinin, eyni zamanda "texniki" tərəflərinin də yalnız qanunla tənzimlənməli olduğunu müəyyən etmir.

Belə ki, sözügedən Konstitusiyanın 73-cü maddəsinin I hissəsində göstərilir ki, *"qanunla müəyyən edilmiş vergiləri və başqa dövlət ödənişlərini tam həcmdə və vaxtında ödəmək hər bir kəsin borcudur"*.

Azərbaycan Respublikasının Vergi Məcəlləsinin (bundan sonra – AR Vergi Məcəlləsi) 12.1-ci maddəsinə nəzər saldıqda belə nəticəyə gəlmək olur ki, yalnız vergi ödəyicisi, vergitutma obyekti, vergitutma bazası, vergi dövrü, vergi dərəcəsi, verginin hesablanması qaydası, verginin ödənilməsi qaydası və müddətinin müəyyən edilməsi ilə vergilər *müəyyən edilmiş* hesab olunur. Beləliklə, AR Vergi Məcəlləsinə əsasən, vergilərin müəyyən edilməsinin əsas şərtləri kimi onun bəzi elementlərini "əsas" elementlər hesab edə bilərik.

Azərbaycan vergi qanunvericiliyində nəinki verginin əsas əlamətləri, həmçinin bir sıra prosedur məsələlər də qanunla (Vergi Məcəlləsi) tənzimlənib. Beləliklə, vergilərin hesablanması, ödənilməsi və yığılması qaydaları, vergi nəzarətinin forma və metodları, dövlət vergi orqanlarının və onların vəzifəli şəxslərinin hərəkətlərindən (hərəkətsizliyindən) şikayət edilməsi qaydaları da vergitutmanın qanuniliyi prinsipi çərçivəsində qəbul edilir.

Bu xüsusda Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 19 yanvar 2001-ci il tarixli 20 nömrəli "Azərbaycan Respublikasının ərazisinə gətirilən aksiz vergisinə cəlb olunan malların aksiz dərəcələrinin təsdiq edilməsi haqqında" Qərarının (17) AR Konstitusiyasının 73-cü maddəsinin həm I, həm də II hissələrinin (qanunda göstərilmiş həcmdən əlavə vergilərin ödənilməsinin qadağan olunması) ilə uyğunsuzluq təşkil etdiyini görə bilərik.

Qeyd edildiyi kimi, "vergitutma obyekti" və "vergi dərəcələri" vergilərin müəyyən edilməsinin əsas elementləridir. Lakin aksizdən azadolmalar, həmçinin Azərbaycan Respublikasında istehsal olunan və Azərbaycan Respublikasına idxal edilən bəzi aksizli mallara tətbiq olunan aksiz dərəcələri AR Vergi Məcəlləsi ilə tənzimlənsə də, həmin Məcəlləyə əsasən, Azərbaycan Respublikasına idxal edilən bəzi kateqoriya mallara münasibətdə tətbiq olunan aksiz vergisinin "əsas" elementlərinin (vergitutma obyektinin və aksiz dərəcələrinin) müəyyən edilməsi səlahiyyətinin müvafiq icra hakimiyyəti orqanına – Nazirlər Kabinetinə (18) həvalə edilməsi vergitutmanın qanuniliyi prinsipinin istisna olunduğu hal kimi hesab oluna bilər.

Hesab edirik ki, bu istisna əsas etibarilə deflyasiya və ya inflyasiya zamanı icra orqanına çevik müdaxilə və qərarvermə imkanı verərək vergitutmanın qanuniliyi prinsipinin "yumşaldılma"sına yönəlmişdir.

## Nəticə

Vergitutmanın qanuniliyi prinsipi vergilərin müəyyən edilməsi səlahiyyətinin yalnız qanunverici orqana məxsus olduğunu və bu səlahiyyətin digər orqana ötürülməsinin mümkün olmadığı mənasına gəlir. AR Konstitusiyası vergitutmanın qanuniliyi prinsipinin əhatəsini və hədlərini müəyyən etməsə də, bu prinsipin mahiyyətinə görə vergilərin müəyyən edilməsi həm məzmun, həm də forma cəhətdən qanunla tənzimlənməlidir. Bu baxımdan, vergitutmanın qanuniliyi prinsipi yalnız vergilərə dair ümumi qaydaların deyil, eyni zamanda onun əsas elementlərinin (vergitutma obyetki, vergi dərəcəsi və s.) də birbaşa qanunla müəyyənləşdirilməli olduğunu deməyimizə əsas verir.

## Ədəbiyyat

1. Thuronyi, V. (2003). Comparative Tax Law. Kluwer Law International, p. 71.
2. Vanistendael, F. (1996). Tax Law Design and Drafting. Chapter 2, Legal Framework for Taxation (Volume 1; International Monetary Fund: 1996; Victor Thuronyi, ed.), p. 4.
3. Azərbaycan Sovet Sosialist Respublikasının 1921-ci il Konstitusiyası. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsinin Prezident Kitabxanası. "Dövlət rəmzləri və atributları", p. 9. https://files.preslib.az/projects/remz/pdf/atr_kons.pdf
4. Azərbaycan Respublikasının Konstitusiyası. (1995). Maddə 3. https://e-qanun.az/framework/897 (son baxış 28 may 2024).
5. "Normativ hüquqi aktlar haqqında" Azərbaycan Respublikasının Qanunu. Maddə 13.5. https://e-qanun.az/framework/21300 (son baxış 28 may 2024).
6. Azərbaycan Respublikasının Vergi Məcəlləsi. (2001). Maddə 3. https://e-qanun.az/framework/46948 (son baxış 03 may 2024).
7. Azərbaycan Respublikası Konstitusiya Məhkəməsinin "Qrant haqqında" Azərbaycan Respublikası Qanununun 5-ci maddəsinin 3-cü bəndinin şərh edilməsi haqqında 26 oktyabr 1999-cu il tarixli Qərarı. https://www.taxes.gov.az/az/post/313 (son baxış 03 may 2024).
8. Azərbaycan Respublikası Konstitusiya Məhkəməsinin "Azərbaycan Respublikası Vergi Məcəlləsinin 78.3, 85.4, 90.3 və 93.1.1-ci maddələrinin şərh edilməsinə dair" 2011-ci il 12 yanvar tarixli Qərarı. https://e-qanun.az/framework/21213 (son baxış 29 may 2024).
9. İspaniya Konstitusiyası. (1978). Maddə 31. https://www.boe.es/legislacion/documentos/ConstitucionINGLES.pdf (son baxış 20 may 2024).
10. Fransa Konstitusiyası. (1958). Maddə 34. https://www.conseil-constitutionnel.fr/sites/default/files/as/root/bank_mm/anglais/constiution_anglais_oct2009.pdf (son baxış 20 may 2024).
11. Belçika Konstitusiyası. (1831). Maddə 170 (1). https://www.dekamer.be/kvvcr/pdf_sections/publications/constitution/GrondwetUK.pdf (son baxış 20 may 2024).
12. Danimarka Konstitusiya Aktı. (1849). Maddə 43. https://www.constituteproject.org/constitution/Denmark_1953 (son baxış 23 may 2024).
13. Grundgesetz [GG]. (1949). Maddə 2(1) (DEU).

https://www.gesetze-im-internet.de/gg/BJNR000010949.html (son baxış 23 may 2024).
14. Yunanıstan Konstitusiyası. (1978). Maddə 78 (1). https://www.hellenicparliament.gr/UserFiles/f3c70a23-7696-49db-9148-f24dce6a27c8/001-156%20aggliko.pdf (son baxış 23 may 2024).
15. Portuqaliya Konstitusiyası. (1976). Maddə 103 (2). https://www.constituteproject.org/constitution/Portugal_2005 (son baxış 24 may 2024).
16. Bolqarıstan Konstitusiyası. (1991). Maddə 60 (2). https://www.parliament.bg/en/const (son baxış 24 may 2024).
17. Azərbaycan Respublikasının ərazisinə gətirilən aksiz vergisinə cəlb olunan malların aksiz dərəcələrinin təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı. https://e-qanun.az/framework/4590 (son baxış 30 may 2024).
18. "Azərbaycan Respublikası Vergi Məcəlləsinin təsdiq edilməsi, qüvvəyə minməsi və bununla bağlı hüquqi tənzimləmə məsələləri haqqında" Azərbaycan Respublikası Qanununun və bu Qanunla təsdiq edilmiş Azərbaycan Respublikası Vergi Məcəlləsinin tətbiq edilməsi barədə Azərbaycan Respublikası Prezidentinin Fərmanı. (2000).

Göndərilib: 18.03.2024 Qəbul edilib: 26.04.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/108-113

**Samra Zulfigarova**
Baku State University
master student
its.zulfiqarova@gmail.com
UDC: 7M04212

# GLOBAL ENERGY POLICIES AND ENERGY CONTRACTS

## Abstract

This article examines global energy policies and energy agreements, discusses the importance of energy to countries, identifies and substantiates problems in global energy policy. Today, global energy policy is mainly analyzed in terms of oil and natural gas. The regions that form the basis of these policies are the Middle East, Central Asia and Caspian regions, which have the largest share in terms of resources. There is serious global competition in the field of exploration, production and delivery of oil and natural gas to international markets. Energy is a vital issue for the European Union, as it is for the rest of the world. The importance of energy comes from the fact that it is used as a basic resource in almost all economic activities. Energy is concluded as an indispensable factor for economic development.

In addition, energy has properties that make life easier and improve people's quality of life. Based on the research, the author suggests that the European Union, which has a unique structure, should not be neglected in this vital energy field. Although the EU is not indifferent to the energy issue, it is still debatable whether the progress made in the energy field is sufficient to meet the EU's energy needs.

***Keywords:*** *energy, global energy, energy contracts, petrol, natural gas*

**Səmra Zülfiqarova**
Bakı Dövlət Universiteti
magistrant
its.zulfiqarova@gmail.com
UDC: 7M04212

# Qlobal enerji siyasətləri və enerji müqavilələri

## Xülasə

Bu məqalədə qlobal enerji siyasətləri və enerji sazişləri tədqiq olunur, həmçinin enerjinin ölkələr üçün əhəmiyyətindən bəhs edilir, qlobal enerji siyasətindəki problemlər müəyyən edilir və əsaslandırılır. Bu gün qlobal enerji siyasətini, əsasən, neft və təbii qaz təhlil edilir. Bu siyasətlərin əsasını təşkil edən regionlar isə ehtiyatlar baxımından ən böyük paya malik olan Yaxın Şərq, Mərkəzi Asiya və Xəzəryanı regionlardır. Neft və təbii qazın kəşfiyyatı, hasilatı və beynəlxalq bazarlara çatdırılması sahəsində ciddi qlobal rəqabət var. Enerji bütün dünyada olduğu kimi, Avropa İttifaqı üçün də həyati əhəmiyyət kəsb edən məsələdir. Enerjinin əhəmiyyəti onun demək olar ki, bütün iqtisadi fəaliyyətlərdə əsas vəsait kimi istifadə edilməsindən irəli gəlir. Enerji iqtisadi inkişaf üçün əvəzsiz amil kimi nəticəyə gəlinir.

Bundan əlavə, enerji həyatı asanlaşdıran və insanların həyat keyfiyyətini yaxşılaşdıran xüsusiyyətlərə malikdir. Tədqiqat əsasında müəllif təklif edir ki, unikal struktura malik olan Avropa İttifaqı bu həyati enerji sahəsində laqeyd qalmasın. Aİ enerji məsələsinə biganə qalmasa da, enerji sahəsində əldə edilən irəliləyişlərin Aİ-nin enerji ehtiyaclarını ödəmək üçün kifayət edib-etməməsi hələ də mübahisəlidir.

***Açar sözlər:*** *enerji, qlobal enerji, enerji müqavilələri, benzin, təbii qaz*

## Introduction

Energy resources are one of the basic inputs that are essential for the economic development of countries. Sustainable energy policies, in addition to ensuring supply security and diversifying supply sources, aim to supply the type of energy desired to be used to the society at a low cost and in the requested quantity and quality.

Today, 87 % of the world's total energy production is provided by fossil fuels, 6 % by renewable resources, and 7 % by nuclear energy. Approximately 64.5 % of the world's electrical energy production comes from fossil resources (38.7 % coal, 18.3 % natural gas, 7.5 % oil).

In line with the current level of technology and predictions, 88% of the world's general energy demand will be consumed in the next 30 years. It is estimated that a very significant part of it will be covered by fossil resources.

While 46 % of the oil produced in the world today is subject to interregional trade, this rate is expected to increase to 63 % in 2030. In terms of natural gas, it is thought that both the amount to be produced will increase and the percentage transported between regions will increase from 15 % to 26 % in 2030.

Coal, which is among the fossil resources used in energy production, is a widely used fuel in the world due to its ease of production, consumption and reliability. Today, approximately 25 % of global energy demand is provided by coal sources. However, in terms of global markets, coal is generally a locally-regionally preferred fuel type.

The high cost of obtaining renewable energy types in general, the difficulty in storing the intermittent energy obtained from many of them, and the limited renewable energy infrastructure prevent the widespread use of renewable energy in the world. However, due to increasing awareness about global warming and environmental issues and developments in energy production and transmission technologies, the demand for renewable energy resources is expected to increase in the coming years.

### Global energy policies and energy contracts

Energy policy is generally related to technology, economy and energy. It consists of the institutional structure where decisions are made and includes supply-demand management in the short term and planning activities in the long term (Bayrach, Aras, 2007: 14). In addition to the scarcity of energy resources and the gradual decrease in their reserves, the greenhouse effect and climate changes resulting from global warming require the production of energy policies at national and international levels that take into account the interests of future generations.

In the energy market, balance and therefore price is created by energy supply and demand. The main factors that determine energy demand are economic growth, lifestyle, development level of society, technological development and energy prices. In determining energy supply, reserves, production and investment costs, conversion technologies, and economic and political relations between countries and regions are among the main factors that need to be considered.

Continuously predicting the factors affecting energy supply and demand with scientific and real methods, updating them in line with global changes and revising them when necessary is an important prerequisite for effective energy policies (Pamir, 2006: 4).

Energy supply security is a concept that includes the principles of availability, accessibility and acceptability. In this context, energy security is defined as providing energy at affordable prices and in sufficient quantities (Ushumezsoy, Shen, 2003: 106). One of the most important problems in energy supply security is ensuring production and transportation security in meeting energy demand, as supply and demand are located in different geographies.

The concept of energy security changes depending on whether a country is an energy producer or consumer. Just as "energy supply security" is important for countries that have to import energy from abroad because they produce less energy resources than they need, "energy demand security" is as important for countries that produce more than they need and export. In this respect, energy security; In addition to being an international issue, it also shows that producers and consumers are mutually dependent on each other (Ediger, 2007: 5).

There are some differences in energy demand security depending on the development level of the country. For example, while the uninterrupted flow of energy imports is important for developed countries, it is more important for developing countries with a balance of payments deficit to obtain energy at as low and stable prices as possible.

A significant disruption in global energy resources and/or transmission lines negatively affects the world economy. For energy supply security, countries need to diversify their energy supply portfolio and types, increase efficiency in energy consumption and develop effective energy management strategies.

Privatization and liberalization activities in energy markets as a result of globalization and the legal and structural change process carried out for this purpose have created significant uncertainty in the world energy market. This environment of uncertainty has revealed the need to attach importance and invest in domestic resources.

Since the oil crises of the 1970s, many industrialized countries have initiated various programs to develop renewable energy solutions. However, low oil prices have been one of the most important factors preventing the development of renewable energies. Today, renewable energy provides 13.1 % of global energy reserves and 17.9 % of world electricity production (5).

Nuclear energy has a share of approximately 7.6 % in global energy production. Especially since the waste problem has not yet been solved, new power plants are not built with existing technologies in the USA and EU countries, and those that have completed their economic life are decommissioned. However, intensive R&D studies are continuing to solve the waste problem and to build safe power plants with new technologies.

All renewable resources, especially solar, wind and geothermal, are considered as the energy sources of the future because they are clean fuels and renewable (Karajan, 2007: 245). However, there are also some technical, economic and institutional obstacles that restrict the widespread use of renewable energies. The most important of these obstacles include high installation and transmission costs, intermittent production and storage problems.

Although renewable resources do not yet have the technologies to compete economically with other conventional resources, they are increasingly coming to the fore in energy policies, especially in the EU, in terms of both the promotion of clean energy and resource diversity (Ozsabunjuoghlu, Ughur, 2005).

Today, global energy policies are determined by fossil fuels, mainly oil and natural gas. The areas that determine the basis of these policies are the Middle East, Central Asia and the Caspian regions, which have the most important reserves.

Among the fossil fuels in the world, oil and natural gas deposits are not distributed equally across regions as coal reserves. While developing countries have large amounts of oil and natural gas reserves, developed countries that consume the most oil and gas have few or negligible reserves.

In the energy market, not only resources, but also the safety of routes and pipelines that will ensure the delivery of these resources to consumers is of great importance for consumers (Pamir, 2006: 24). For this reason, both supply and demand and trade routes must be secured together.

Developed countries want to enter these markets where energy resources are more but consumption is less, and they want to strengthen their energy security policies by maintaining their position in the energy world. For this purpose, by using their technology and financial resource superiority it forces developing countries to impose a series of sanctions with theses such as globalization, new world order, clash of civilizations and definitions of new security understanding.

One of the most important actors in the ongoing energy struggle in the world economy is the USA. The USA, which has the world's largest economy and developed industry, has a significantly increasing energy consumption every year. For this reason, how the USA will obtain energy has begun to be considered as a security problem for the future of the country (BP, 2008).

The USA is developing multifaceted policies to provide the energy resources it needs uninterruptedly, cheaply, from various sources and in safe ways. The USA played important roles in

Middle East oil after 1947. The USA, which has great influence in this region outside its geographical borders, has been using the oil here for its own country for years.

The USA, which alone consumes ¼ of the energy consumed in the world, imports 27 % of this consumption. According to the US Department of Energy, the import dependence ratio of energy consumption is estimated to increase to 38 % in 2025 (Pamir, 2006: 72). The USA can only produce approximately 1/3 of the oil it consumes. The reserves of the USA are only sufficient for 10-11 years with this production rate. If this production ends, it will be a country completely dependent on foreign sources (Ushumezsoy, Shen, 2003: 15).

The USA is developing multifaceted policies to provide the energy resources it needs uninterruptedly, cheaply, from various sources and in safe ways. The USA played important roles in Middle East oil after 1947. The USA, which has great influence in this region outside its geographical borders, has been using the oil here for its own country for years.

The 1973-1974 and 1979 oil crises in the world economy caused lack of supply security, instability in prices and imbalance in the balance of payments in the EU. These problems have led member countries to expand their energy policy goals and tools and to national governments to pursue a more active and determined intervention policy on energy (Harrop, 2000: 147).

In November 1983, the European Council authorized the EU for its own energy policy for the first time. Since this date, several yearly framework programs have been created for measures in the field of energy in the union. In such a framework program, common tasks and goal projections are determined for each member country in terms of increasing energy efficiency, reducing import dependency, using domestic energy resources more and promoting new energy technologies.

The existing institutional framework for energy policy at community level is based on foundation agreements that have been concluded over time towards coordination between EU institutions, member state governments and energy economic associations and companies (Zippel, 2006: 42).

EU energy policy generally has three main objectives. These are competitiveness, energy supply security and environmental protection (Harrop, 2000: 185). While achieving these goals, it is aimed to preserve the share of coal in total energy consumption, increase the share of natural gas, establish maximum safety conditions for nuclear power plants and increase the share of renewable energy sources.

The EU, which accounts for 16 % of global energy consumption, has a structure that is highly dependent on foreign sources for both oil and natural gas. The EU's domestic resources are quite limited and it meets half of its energy needs through imports. The import dependency ratio, which is 80.2 % for oil, is 54.5 % for natural gas and 38.2 % for coal (European Commission, 2006a).

The share of energy in the EU's total imports is around 6 %. The EU enlargement process is expected to further increase foreign dependence on energy. Due to increasing environmental concerns in the EU, the decommissioning of nuclear power plants, which have begun to complete their economic and technical life, and the promotion of the use of natural gas instead of coal in electricity production due to social security and increasing labor costs, are among the important reasons that increase the union's foreign dependency in terms of energy is taking.

In order for the EU's dependence on external energy resources to increase and for these resources to reach the European market without interruption, close relations have been established with the main producers such as the Middle East, the Caspian Region and Russia. Most of the approximately 600 million tons of oil consumed annually in Europe is supplied by countries such as Russia, Algeria, Libya, Iran and Norway (North Sea). Europe is trying to strengthen its relations with countries such as Russia, Iran and North Africa in order to meet its dependence on oil (Ushumezsoy, Shen, 2003: 15).

The Russian Federation comes first among the countries with which the EU can cooperate effectively and in the long term in the field of energy. Russia is aware of this situation and uses its natural gas and oil as leverage in the international energy market. The increasing dependence on Russia in imports creates concerns in terms of supply security and prices, and the EU Commission

warns its members that the share of imports from a non-member country should not exceed 30 % of the total.

With the EU enlargement process, it is trying to increase efficiency by combining the disconnected and relatively small energy markets of the newly joined countries. It is aimed to create an EU-wide energy market by interconnecting energy (electricity and natural gas) networks and liberalizing energy markets (Bayrach, 1999a: 590).

## Conclusion

Today, energy has a position that closely affects and directs economic, political, social and military developments in the international arena. According to IEA predictions, in the next 30 years, most of the world's energy demand will be met by fossil resources, especially oil and natural gas.

In the global energy market, producers, countries on transportation lines and large consumers have important strategic weight. Today, the Middle East and Central Asia-Caspian countries, which have a significant advantage in the world oil and natural gas supply, will maintain these positions for many years to come.

There is a great competition in the exploration, production and transportation of oil and natural gas to international markets, with regional and global power struggles taking place. In this competition, in addition to large states and multinational enterprises, organizations such as IEA, OPEC and various international financial institutions also play a decisive role.

Due to the large amounts of known and unknown reserves of oil and natural gas in the Middle East and Central Asia-Caspian Regions, it is expected that the USA will maintain its presence in the region for a longer time.

In order to reduce the ever-increasing cost of imported energy in the global energy market, and to ensure the sustainability of the energy and environmental problem, the use of renewable energy sources such as solar, wind, hydraulic, hydrogen, wave, geothermal and biomass, which are inadequately utilized, should be increased.

## References

1. Bayrach, H. N., Aras, H. (3-5 May 2007). Sustainable natural gas policies in the world and in Turkey. TMMOB Chamber of Mechanical Engineers, International Natural Gas Congress and Exhibition Book. Ankara.
2. Pamir, A. N. (October 2006). Energy security. Strategic Vision 2023. Eurasian Center for Strategic Studies (ASAM). Ankara: Eurasia-One Foundation Publication.
3. Ushumezsoy, Sh., Shen, Sh. (2003). The New World Oil Order and the Gulf Wars. Istanbul: Inkilap Kitapevi Publishing House.
4. Ediger, Sh. V. (2007). Energy supply security and national security relations. Energy supply security Symposium. General Staff ATASE Presidency, Strategic Research and Research Center (SAREM). Ankara: General Staff Publishing House. No. 47.
5. http://www.iea.org/textbase/papers/2006/renewable_factsheet.pdf, 28.9.2008
6. Karajan, A. R. (2007). Environmental economics and politics (Economics, politics, international and national environmental protection initiatives). Ege University Faculty of Economics and Management. Izmir, No. 6.
7. Ozsabunjuoghlu, I. H. and Ughur, A. A. (2005). Economics of natural resources. Management and politics. Ankara: Imaj Kitapevi Publishing House.
8. BP. (June 2008). Statistical Review of World Energy.
9. Harrop, J. (2000). The Political Economy of Integration in the European Union. Thirt Edition, Edward Elgar, Cheltenham.
10. Zippel, W. (2006). European Union energy policy approaches to diversification of energy resources. Energy Bridge between Europe and Central Asia Turkey. Editors: Werner Gumpel-Alpay Hekimler, Konrad-Adenauer-Stiftung Edition. Ankara.

11. European Commission. (2006a). European Union Energy and Transport in Figures 2006. Brussels, EC.
12. Bayrach, H. N. (1999a). Economic analysis of the international natural gas market, its development in Turkey and its application in Eskishehir. Anadolu University Institute of Social Sciences, unpublished doctoral thesis. Eskishehir.

Received: 01.04.2024 Accepted: 23.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/114-119

**Nilufər Yusifova**
Bakı Mühəndislik Universiteti
magistrant
nilufar.yusifova@gmail.com

# LOGİSTİK STRATEGİYALARIN İŞLƏNMƏSİNİN NƏZƏRİ ƏSASLARI, KONSEPSİYALARI VƏ VƏZİFƏLƏRİ

**Xülasə**

Logistika maddi texniki ehtiyatların axını və saxlanmasının səmərəliliyini planlaşdırma, həyata keçirmə və izləmə prosesidir. Bir məhsulun nəqliyyat, saxlama, gömrük rəsmiləşdirilməsi, qablaşdırma, paylama kimi ilk istehlakçıdan son istehlakçıya qədər olan bütün proseslərə aiddir.

Logistikanın ümumi məqsədi yüksək keyfiyyətli məhsul göndərmələrini təmin edən material, informasiya, maliyyə, kadr və s. axınların funksional menecmentinin səmərəli, interaktiv sistemini yaratmaqdır.

***Açar sözlər:*** *logistika, strategiya, tədarük zənciri, mikrologistik konsepsiya, logistik idarəetmə*

**Nilufar Yusifova**
Baku Engineering University
master student
nilufar.yusifova@gmail.com

## Theoretical foundations, concepts and tasks of logistics strategy development

**Abstract**

Logistics is the nprocess of planning, implementing and monitoring the efficiency of the flow and storage of material and technical resources of a product from the first consumer to the final consumer, such as transportation, storage, customs clearance, packaging, distribution.

The general purpose of logistics is to provide material, information, finance, personnel, etc., which ensure high-quality product shipments. Is to create an efficient, interactive system of functional flow management.

***Keywords:*** *logistics, strategy, supply chain, micrologistics concept, logistics management*

## Giriş

Strategiya arzu və istəklərə deyil, firma və ya müəssisənin malik olduğu real imkanlara əsaslanır. Buna görə də strategiya, hər şeydən əvvəl, firma daxilində və onun xarici mühitində mövcud olan real, obyektiv situasiyanı nəzərə alır, təhlil edir və ona adekvat reaksiyalar verir.

Qeyd etmək lazımdır ki, logistikanın strateji və taktiki iqtisadi səmərəliliyinin mühüm şərti material axınlarının hərəkətini təşkil edən hər bir elementin – tədarükatın, istehsalın, anbarlaşdırmanın, ehtiyatların, bölüşdürmə və satışın, nəqletmənin planlaşdırılmasının təşkilidir. Bu cür təşkil bir qayda olaraq başlanğıc nöqtə kimi tələb dinamikasının müntəzəm formada gözlənilməsindən başlamaqla logistik sistemə daxil olan hər bir element üzrə plan göstəricilərinin işlənib hazırlanmasından ibarətdir.

Logistika anlayışına nəqliyyat, xidmət, anbar, materialların komplektləşdirilməsi və hərəkət xəttinin təhlükəsizliyi haqqında informasiyalar da daxildir.

Logistika əmtəənin sıradan çıxdıqda məhv edilməsi məsələləri ilə də məşğul olur. Logistikanın ümumi vəzifələri dedikdə, logistikanın qarşısında duran məqsədlərə çatmaq üçün hansı işlərin, hansı ardıcıllıqla, nə vaxt və harada icra edilməsi nəzərdə tutulur. Hər hansı bir təsərrüfat subyekti material axınlarının idarə edilməsi sahəsində özünün ümumi və xüsusi xarakterli logistik vəzifələrinin müəyyənləşdirilməsidir ki, onlar da aşağıdakılardan ibarətdir:

1. Logistik konseptual ideya – mövcud şəraitdə ən az mümkün xərclərlə firmanın bazarda baş verən dəyişikliklərə uyğunlaşmasıdır ki, bazar payının artırılması və rəqiblər üzərində iqtisadi üstünlüklərə nail olmaqdan ibarətdir.

2. Logistikanın ümumi məqsədi – yüksək keyfiyyətli məhsul göndərmələri təmin edən material, informasiya, maliyyə, kadr və s. axınların funksional menecmentinin səmərəli, inteqrativ sistemini yaratmaqdır.

"Müasir sənaye müəssisəsinin işində logistikanın rolu kifayət qədər böyükdür. Buna görə də hər hansı bir şirkətin rəhbərliyi malların daşınması proseslərini sistemləşdirəcək bir şöbənin yaradılmasının qayğısına qalmalıdır. Müəssisənin strukturunda yerləşən belə bölmə logistika idarəetməsini müəssisənin gündəlik həyatına daxil etməlidir. Xidmət birbaşa şirkət rəhbərinə tabe olmalıdır.

Belə bir şöbəyə malik müəssisələr sifarişləri səmərəli yerinə yetirmək mümkün olmayan bütün funksiyaları mərkəzləşdirilmiş şəkildə idarə olunan güclü mexanizmdə birləşdirir, onun köməyi ilə istənilən mürəkkəblikdə olan vəzifələr peşəkar səviyyədə və böyük bir şəkildə həll edilir. Amma eyni zamanda nəzərə almaq lazımdır ki, maddi-texniki təchizat şöbəsində işləmək müvafiq struktur bölmələrinin fəaliyyətini əvəz etməlidir" (1).

Logistik strategiyalar dedikdə, korporativ hədəflərə uyğun olaraq formalaşdırılmış, şirkətdə həyata keçirilməsinin forma və vasitələri, funksiyalararası və təşkilatlararası koordinasiya və inteqrasiya ilə əlaqəli uzunmüddətli, yaxşı müəyyən edilmiş bir istiqamətdir. Yəni hər bir şirkət özünün logistik strategiyasını o zaman qurmaq istəyir ki, hər hansı bir yeniliklər istəyir və yaxud da mənfəətinin artırılması və ya mənfəətinin olduğu həcmdə saxlanılmasına çalışır.

Logistik strategiyalar niyə tətbiq olunur? Biz bilirik ki, bazar iqtisadiyyatının xüsusi bir hissəsi olan tədarük zənciri davamlı olaraq dəyişdiyi və inkişaf etdiyi üçün şirkət müəyyən edilmiş malları, müəyyən ölkələrə və ya müəyyən müştərilər üçün realizə etmək məqsədilə müxtəlif logistik strategiyalardan istifadə edirlər.

"Tədarük zənciri bir çox funksiyanı özündə birləşdirən bir şəbəkədir. Bu şəbəkə daxilində ilk növbədə son məhsul və xidmətlərə çevrilmək üçün lazım olan ehtiyatlar əldə edilir. Bu ehtiyatlar əsasında hazır məhsul, xidmət təşkil edilir. Bundan sonra bu məhsul və xidmət logistika xidməti ilə istehlakçılara, yəni müştərilərə çatdırılır. Belə təsəvvür etdikdə tədarük zənciri çox sayda işçini birləşdirən və bir çox müəssisəni əhatə edən bir zəncirdir. Tədarük zənciri tədarükün münasib şərtlərlə əldə edilməsi, onların istehsalat prosesində işlənilməsi uyğun şəraitdə saxlanması, müştəri məmnuniyyətinin qorunması, maliyyə itkilərinin olmamasına, malların zədələnmədən son nöqtəyə çatdırılmasına diqqət etmək lazımdır" (2).

Konsepsiya baxışlar sistemi olub, hadisə və proseslərin bu və ya digər dərəcədə başa düşülməsi kimi izah edilir.

İqtisadiyyatın logistikləşdirilməsi prosesinin dərk edilməsi, öyrənilməsi material və onlara bərabər tutulan maliyyə və informasiya axınlarının ilkin mənbədən son təyinat məntəqəsinə qədər hərəkətilə bağlı yerinə yetirilən əməliyyatlar logistik yanaşma ideyasının başa düşülməsinə əsaslanır. İstehsal, kommersiya, sahibkarlıq və təsərrüfat fəaliyyətinin digər növləri kimi material axınlarının idarə edilməsi ilə əlaqədar olan fəaliyyət də ilkin inkişaf mərhələsindən başlayaraq müxtəlif dövrlərdə insanlar tərəfindən həyata keçirilmişdir.

"Dünya təsərrüfat sistemində ən geniş yayılmış mikrologistik konsepsiyalardan biri JIT (just-in-time) "dəqiq vaxtında" konsepsiyası hesab edilir. Bu sistem ilk dəfə yapon istehsalçıları tərəfindən təklif edilmiş və verdiyi iqtisadi səmərə baxımından özünü ABŞ-da da təsdiq etmişdir. Daha doğrusu, bu konsepsiyanın meydana gəlməsi Yaponiyanın Toyota Motors və digər avtomobil şirkətlərinin KANBAN mikrologistik sisteminin geniş tətbiq edilməyə başlandığı ötən əsrin 50-ci illərinə təsadüf edir. "Dəqiq vaxtında" konsepsiyası məntiqi baxımdan əmtəəlik məhsulun istehsalı üçün lazımi material resursları üzrə ehtiyatların səviyyəsini mövcud məhsul partiyasının istehsalına lazım olan həddə qədər minimumlaşdırmaqdan ibarətdir. "Dəqiq vaxtında" (JIT) konsepsiyasını tətbiq edən logistik sistemlərin əsas ideologiyasını dartıcı sistemlər təşkil edir" (3).

Müasir dünyada qlobal təhlükə yaradan bir çox amillər vardır. Dayanıqlı logistika ideyası sənaye tərəfindən ciddi qəbul edilən bir mövzudur. Logistika sektorunda dayanıqlılıq əldə etmək üçün şirkətlər müxtəlif strategiyalara baş vururlar. Bu gün bir çox müəssisələr hələ də dayanıqlılığın sadəcə ekoloji cəhətdən təmiz olduğunu düşünürlər. Buna görə də dayanıqlılığın nə üçün zəruri olduğunu müzakirə etməzdən əvvəl konsepsiyanı düzgün müəyyənləşdirmək lazımdır.

Dayanıqlılıq anlayışı çox dinamik bir anlayışdır. Sadə dillə desək, gələcək nəsilləri nəzərə almaqla, dünyadakı bütün növ resursların ehtiyatla istehlak edilməsi zərurətini özündə əks etdirən sosial yanaşma kimi başa düşülə bilər. Üstəlik bunu təmin etmək kortəbii bir vəziyyət deyil, birdən çox tərəfin bir araya gələrək dayanıqlılığı təmin etmək səylərindən asılıdır. Bu nöqteyi-nəzərdən bir çox tədqiqatçılar dayanıqlılığı ekoloji, sosial və iqtisadi elementlərin birləşməsi kimi müəyyən ediblər.

"Sənaye inqilabından sonra bir çox sahələrdə sənaye fəaliyyəti sürətləndi. Biznes və şirkətlərin öz sektorlarında varlığını davam etdirmələri və böyümələri üçün əlavə olaraq onların ekoloji, iqtisadi, sosial və bir çox başqa sahələrdə dəstəyə ehtiyacı var. İstehsal prosesi ilə məşğul olarkən ətraf-mühitə və ya təbii sərvətlərə laqeyd yanaşmaq digər sektor və insanlar üçün narahatlıq doğurur.

Dayanıqlılıq anlayışı bu nöqtədə meydana gəlir və şirkətləri məsuliyyəti öz üzərinə götürməyə məcbur edir. Bu anlayış resursların istehlakını məhdudlaşdırmaqla yanaşı, yeni strategiyaların meydana çıxmasını təmin edir. Bəzən şirkət və bizneslərin işi bir çox müxtəlif sahələri əhatə edir və dayanıqlılıq konsepsiyasının üstün cəhəti bu zaman özünü göstərir ki, o bütün bu sahələrə inteqrasiya oluna bilir. Aydındır ki, bu gün logistik fəaliyyətlərdə artım müşahidə olunur. Bu artım özü ilə bərabər logistika sahəsində dayanıqlılığın qiymətləndirilməsini də gətirir" (4).

"Logistikanın ümumi vəzifələri dedikdə, logistikanın qarşısında duran məqsədlərə çatmaq üçün hansı işlərin, hansı ardıcıllıqla, nə vaxt və harada icra edilməsi nəzərdə tutulur. Logistikanın ümumi məqsədi budur: yüksək keyfiyyətli məhsul göndərmələri təmin edən material, informasiya, maliyyə, kadr və s. axınların funksional menecmentinin səmərəli, interaktiv sistemini yaratmaq.

Logistika istifadəsi müəssisəsinin mövcud bazar mühitinə uyğunlaşmasını maksimum dərəcədə artırmağa, mənfəət payını artırmağa və birbaşa rəqiblərdən açıq üstünlük əldə etməyə imkan verir" (5).

Sənayecə inkişaf etmiş ölkələrdə logistikanın inkişaf etdirilməsi probleminə artan maraqlar, hər şeydən əvvəl, tarixi baxımdan iqtisadi xarakterə malik səbəblərlə əlaqədardır. İstehsalın həcminin artdığı, ölkədaxili və beynəlxalq əlaqələrin genişləndiyi bir şəraitdə mübadilə sferasına aid olunan xərclərin də səviyyəsinin yüksəlməsi faktoru sahibkarların bazar fəaliyyətinin optimallaşdırılması məqsədilə yeni formaların axtarılıb tapılması üçün səylərini gücləndirdi.

Logistikadan aktiv istifadə edən qərb ölkələrinin praktiki təcrübəsi göstərir ki, xammal, material, yarımfabrikat və dəstləşdirici məmulatların ilkin mənbədən son təyinat məntəqəsinə qədər ümumi hərəkətinin 93 %-i onların müxtəlif maddi-texniki təchizat kanallarından ötüb keçməsinə, daha doğrusu, əsasən tədavül kanallarında yığılıb qalmasına və saxlanmasına sərf edilir.

"Deməli, logistikanın inkişafı əhəmiyyətli dərəcədə istehsal strategiyasında və malyeridilişi sitemində mühüm dəyişikliklərlə müşahidə olunan satıcı bazarından alıcı bazarına keçidlə əlaqələndirilir. İstehsalçıların istehlakçılara icbari formada təhkim edilməsi, resursların ciddi və sərt mərkəzləşdirilmiş qaydada "bölgüsü" prinsipinə əsaslanan totalitar təsərrüfatçılıq, inzibati-amirlik sistemində bu və ya digər məhsulun istehsalına qərarın verilməsi onun satış siyasəti (strategiyası) ilə uzlaşdırılmırdı. Yəni satış siyasətinin işlənməsi bir qayda olaraq məhsul istehsalından sonda gəlir və onun təşkili istehsalın diqtəsi – hökmü ilə həyata keçirilirdi" (6).

Logistikanın məqsədi, prosesin optimallaşdırılmasına əsaslanan maddi və əlaqəli axınların səmərəli idarə edilməsidir. İqtisadiyyatda maddi axınların idarə edilməsi prosesində bir çox fərqli vəzifələr həll olunur.

1. Tələb və istehsalın proqnozlaşdırılması, nəqliyyat həcmi.
2. Optimal həcm və maddi axın istiqamətlərinin müəyyən edilməsi.
3. Anbar, qablaşdırma, nəqliyyat və digərlərinin təşkili.

Logistikanın əsas məqsədi əvvəlcə xammal çatdırmaq, sonra müəyyən bir müddətdə lazımi miqdarda göstərilən yerə hazır məhsulu müəyyən bir müddətdə təyin etməkdir.

"Düzgün logistika həm dövrdə, həm də resursların qıtlığı şəraitində axın proseslərini optimallaşdırmaqla şirkətlərin fəaliyyətinin rasionallaşdırılmasını əhatə edən müasir uğurlu biznes üçün vacibdir. Başqa sözlə, təşkilatların fəaliyyəti bu gün həyata keçirilən bütün proseslərin logistikasını tələb edir.

Logistikanın məqsədi lazımi anda və istifadə olunan istehsal ehtiyatlarının həyata keçirilməsi üçün ən aşağı qiymətə istehlakçını məhsullarla təmin etməkdir.

Logistika prosesləri təşkilatların praktik fəaliyyəti dövründə təkmilləşdirilmiş, sübut edilmiş logistika texnologiyalarından ibarətdir.

Sirr deyil ki, ən qabaqcıl texnologiya ilə maddi axınları idarə etmək üçün adekvat sistem yaratmadan yüksək səmərəliliyə nail olmaq mümkün deyil. Yalnız logistika və rəhbərliyin qarşılıqlı əlaqəsi, logistika texnologiyalarının həyata keçirilməsi səbəbindən bazarda rəqabət qabiliyyətlərini gücləndirmək imkanı olan müəssisələrlə işləyə bilər" (7).

Logistika və ticarət sahəsi bütün sektorların inkişafında bünövrə rolunu oynamaqla, əlavə dəyərin və yeni iş yerlərinin yaradılmasında və gəlirliliyin artırılmasında mühüm rol oynayır. Azərbaycanda keyfiyyət və kəmiyyət göstəricilərinin yüksəldilməsi perspektivi üzərində qurulan logistika və ticarət sahəsində regional və qlobal dəyər zəncirlərinə inteqrasiya, dünyanın ən qabaqcıl təcrübələrinə dair nümunələrə əsaslanan tranzit ticarətindən yüksək gəlir əldə etmək məqsədilə əlavə dəyər yaradan xidmətlər təmin olunacaqdır.

"Azərbaycanın coğrafi mövqeyi ticarət həcmlərinin müntəzəm artırılmasına imkan verir. Ölkənin logistika aktivlərinin daim inkişaf etdirilməsi onun regional və beynəlxalq ticarətdə rolunun artmasına təkan verəcəkdir. Belə ki, həm Şərq – Qərb dəhlizi, həm də Şimal – Cənub dəhlizi üzərindəki əlverişli coğrafi mövqeyi sayəsində ölkəmiz həm tranzit ticarəti, həm də idxal-ixrac əməliyyatlarından pay əldə etmək imkanına malikdir. Yeni liman və dəmir yolları ilə bağlı bir sıra mühüm infrastruktur layihələri artıq yekunlaşmaq üzrədir. Bu aktivləri və üstünlükləri nəzərə alaraq, Azərbaycanın ərazisində intermodal və multimodal (müxtəlif nəqliyyat növlərinin ehtiva edilməsi) logistika infrastrukturunun yaradılması vasitəsilə ticarət həcminin artırılması, tranzit ticarətindən daha çox dəyərin əldə edilməsi və logistika sahəsində özəl sektorun iştirak səviyyəsinin artırılması məqsədilə bir sıra təşəbbüslər həyata keçiriləcəkdir" (8).

Logistika idarəetməsi müasir müəssisələrin idarə edilməsinin tərkib hissəsidir. Bu, mənfəəti artırmaq və xərcləri minimuma endirmək üçün resurs axınlarının idarə edilməsinə, onları optimal vəziyyətə gətirməyə aiddir.

İqtisadiyyat tədqiqatçıları hələ də terminin tərifi ilə bağlı konsensusa gəlməyiblər. Yerli alimlərin məşhur nəzəriyyələrini öyrənərək, bir neçə müddəaları ayırd etmək olar. Logistik idarəetmə belədir:

- müəssisənin məqsəd və vəzifələrinə nail olmaq üçün tədarükün, istehsalın və satışın idarə edilməsi üzrə tədbirlər kompleksi, bunlardan başlıcası mənfəətin maksimumlaşdırılmasıdır;
- daxili və xarici mühitlə əlaqəli proseslərin idarə olunduğu bir vasitədir;
- logistik məqsədlərə çatmağa yönəlmiş fəaliyyətlər toplusudur;
- təşkilatdakı maliyyə, iqtisadi və hüquqi proseslərə təsiri;
- müəssisənin əmək, intellektual, maddi və digər resurslarından istifadə etməklə məqsədlərə çatmaq prosesi;
- istehsal olunan məhsulların satışı və ya xidmətlərin göstərilməsi yolu ilə maksimum mənfəət əldə etməyə yönəlmiş fəaliyyətlər.

"Logistika menecmentinin aşağıdakı əsas funksiyalarını ayırd etmək olar:

*Sistem qurma*. İstehsal və idarəetmə prosesini zəruri resurslarla təmin etmək üçün texnologiyalar sisteminin formalaşdırılması.

*İnteqrasiya.* Logistika satış, saxlama və təchizat proseslərini sinxronlaşdırmaq və əlaqələndirmək üçün nəzərdə tutulmuşdur. Logistika sistemində iştirakçıların maraqlarının ardıcıllığı da təmin edilməlidir.

*Tənzimləyici.* Logistika sisteminin fəaliyyətinin təşkilatın ümumi maraqlarına uyğunluğu təmin edilir. Bir qayda olaraq, bu, xərclərin minimuma endirilməsi ilə ifadə edilir.

*Nəticə.* Logistik fəaliyyətlər iş planının yerinə yetirilməsinə yönəldilmişdir (müəyyən vaxtda müəyyən bir alıcıya müəyyən miqdarda məhsul təqdim etmək)" (9).

Müasir qloballaşmanın hökm sürdüyü dünyada logistikanın rolu əhəmiyyətli şəkildə artmışdır. Müştəri məmnuniyyətini artırmaq üçün logistikanın düzgün təşkil olunmasının və logistik xərclərin, itkilərin azaldılması ilə bu uğura nail olmaq mümkündür. Bunun üçün logistikanın bir halqası olan anbarlama proseslərini məsuliyyətlə və ən düzgün formada həyata keçirə bilən mütəxəssislərə ehtiyac vardır.

Logistika modulunu öyrənməklə bu prosesin mahiyyətini anlamaq üçün bilikləri tətbiq etmə bacarığı əldə etmək mümkündür. Bunun üçün logistikanın tədarük zəncirində, anbarın logistik idarə edilmədə yeri haqqında aydın təsəvvürlərə ehtiyac vardır. Ölkəmizdə bu sahə yeni olduğu üçün onun haqqında həm praktiki işlərə, həm də nəzəri araşdırmalara rast gəlinir.

"Qloballaşan və rəqabətin artdığı iş dünyası daxilində var ola bilmək, tələbə uyğun məhsul təqdim edə bilmək, müştəri məmnuniyyətini təmin etmək üçün müəssisələr tədarük zənciri yaratmaq məcburiyyətindədirlər. Bildiyimiz kimi, hal-hazırda bazar şərtləri kəskinləşməkdədir. Bu şərtlər daxilində müəssisələr maliyyəyə qənaət edilməsi və maliyyə itkilərinin minimuma endirilməsi üçün səy göstərirlər. Bundan əlavə, onlar texnologiya ilə ayaqlaşmalı və digər əməkdaşlarla birlikdə yaradılan tədarük zənciri vasitəsilə məhsul və xidmətlərin müştərilərə çatdırılmasını təmin etməlidirlər" (10).

Logistikanın inkişaf təkamülü sənayecə inkişaf etmiş ölkələrdə bazar iqtisadiyyatının tarixi və inkişaf təkamülü ilə sıx bağlıdır. Buna baxmayaraq, "logistika" anlayışından 1970-ci illərin sonlarından etibarən dünya ölkələrinin iqtisadi təsərrüfat sistemində hərtərəfli və geniş istifadə olunmağa başlandı. Artıq yarım əsrdən çoxdur ki, qərb dünyasında mütəxəssislər, alim və biznesmenlər arasında logistika anlayışının özü və mahiyyəti haqqında aparılan intensiv mülahizələr səngimək bilmir. Logistikaya aid qərb ədəbiyyatlarının apardığı geniş təhlilə əsasən belə nəticəyə gəlmək olar ki, bir sıra müəlliflər eyni bir əməliyyatın, funksiyanın və hərəkətin təsviri üçün müxtəlif anlayışlardan istifadə edirlər. Bu da bir çox hallarda tədqiqatçılar, alim və mütəxəssislər arasında logistikanın nəzəri və metodoloji bazasının formalaşması baxımından müəyyən qədər çətinliklər yaradır.

"Logistika yeni elmi sahə olduğundan bu və ya digər terminə – anlayışdan istifadə olunması tədqiqatçıların zövqündən asılı olsa da, logistik proseslərin ayrı-ayrı tərəflərinə xüsusi olaraq diqqətin yönəldilməsi onların arzusu ilə əlaqələndirilir. Məsələn, nümunə kimi göstərmək olar ki, "fiziki bölüşdürmə" terminindən ötən əsrin 70-ci illərinə qədər logistikanın müasir anlamının sinonimi kimi intensiv istifadə olunurdu. Lakin hal-hazırda inteqrativ logistikanın kompleks funksiyalarından biri hesab edilən "fiziki bölüşdürmə" termini "distribyusiya" termininin sinonimindən başqa bir şey deyil.

Elmi fənn kimi logistika ayrı-ayrı bölmələrə: təchizatın logistikası (logistics of supply), istehsal (sənaye) logistikası (produclion logistics), satış logistikası (logistics of distribution), nəqliyyat logistikası (traffic logistics) və s. ayrılmışdır. Bununla yanaşı, yaxın xarici ədəbiyyatlarda, xüsusi ilə MDB məkanında o qədər də çox olmayan ədəbiyyatlar içərisində sənaye (istehsaldaxili), istehsal-kommersiya, kommersiya, tədarükat, satış, nəqliyyat, bölüşdürücü, sahibkarlıq, qlobal, beynəlxalq logistika, logistik menecment, logistik biznes anlayışlarına və adlara rast gəlinir" (11).

"İxtiyari bir sitemin inkişaf strategiyasının hədəfi maksimal elmi texniki, istehsalat, kadr potensialı, mikro və makro mühitin təsir proseslərinin öyrənilməsidir. Logistika ilə əlaqəli olan bütün uzun müddətli məsələlərin həlli logistikanın strategiyasını müəyyən edir. Bu strategiyanın öyrənilməsində logistik sistemin daxili və xarici strukturunun öyrənilməsinə üstünlük verilməlidir.

Daxili faktorlar logistik sistemin daxilində nəzərə alınır və variasiya edilir.

Strategiyanın tərkib hissəsini təşkil edən əsas daxili faktorlar aşağıdakılardır:

1.1. Məhsul: istehsal edilən, satılan, onun çeşidləri, keyfiyyəti, miqdarı və s.

1.2. Kadr: tərkibi keyfiyyəti, sayı, hazırlıq imkanları, peşələrin birləşməsi və s.

1.3. Maliyyə: şəxsi istiqraz və onların nisbəti.
1.4. Gücü: gücün tez bir zamanda artırılması, işləməyən xətlərin bərpa edilməsi.
1.5. İstehlakçıya münasibət: əlavə xidmət, zəmanət, sığorta və s.
1.6. Təşkilat: idarə strukturunun seçilməsi – xətti, funksional, qərargah, matrissalı və s.

Logistik sistemin xarici faktorlarını da nəzərə alaraq, onlara müasir reaksiya vermək də vacibdir. Logistik sistemlər optimal variantlarda xarici şəraitlərə adaptasiya olunurlar. Xarici faktorların arasında aşağıdakıları qeyd etmək olar:

2.1. Tələbin növləri: Elastiki və ya qeyri elastiki.
2.2. İstehlakçılar: Tərkib üstünlüyü və s.
2.3. Bazar şəraiti: Mükəmməl və qeyri-mükəmməl rəqabət.
2.4. Rəqiblər: Sayı, keyfiyyət tərkibi, istehsal həcmi və b.
2.5. İqtisadi iqlim: Vergi, kredit sistemi, azad iqtisadi zonalar və b.
2.6. Siyasi şəraitlər: Ölkənin dövlət quruluşu, dövlət orqanlarının iqtisadi dəyişikliklərə reaksiyası və s.
2.7. Sosial şəraitlər: Əhalinin yaşayış şəraiti” (12).

## Nəticə

Tədqiqatçı logistik strategiyaların işlənməsinin nəzəri əsaslarını, konsepsiyalarını və vəzifələrini araşdırmağı qarşısına məqsəd qoymuşdur. Onun araşdırması müasirlik baxımından çox aktualdır. Bu mənada bu tədqiqat işinin önəmi, əhəmiyyəti çox vacibdir.

Müasir dövrdə ölkələr arasında logistik əlaqələr dövlətlərin yürütdüyü xarici siyasətlə prioritet təşkil edir. Müasir dövrdə münaqişələrin böyük əksəriyyəti logistik inhisarçılığı əldə etmək üçün yürüdülən siyasətin nəticəsi olaraq baş verir.

Müəllif tədqiqat işində üzərinə götürdüyü missiyanı, demək olar ki, yerinə yetirmişdir.

## Ədəbiyyat

1. az.techonfrants.com>17433132-work-in-logistics-...
2. https://www.e-derslik.edu.az
3. https://unec.edu.az>2015/11
4. https://sglogistics.az>dayaniqli-lo...
5. https://sharklogistics.az>Logistika...
6. https://www.scribd.com>document
7. newsaperp.com>Təhsi...
8. yenigundem.az>strateji-ehemiyyet-dasiyan-logistik...
9. az.modern-info.com>Biznes
10. marja.az>88842/azerbaycanda-logistika-sisteminin-...
11. pdfcoffee.com
12. https://imgs.su>upload

Göndərilib: 24.03.2024 Qəbul edilib: 11.05.2024

## TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/103/120-125

**İbadulla Ağayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
amuepid@mail.ru
**Xatirə Xələfli**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
khalafli@mail.ru
**Məhərrəm Niftullayev**
Azərbaycan Tibb Universiteti
tibb elmləri doktoru
mniftullayev@gmail.com
**Cavanşir Rəhimov**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
javanshir.rahimov@mail.ru
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com

# EPİDEMİOLOGİYANIN TİBB ELMİ VƏ SƏHİYYƏ ÜÇÜN ƏHƏMİYYƏTİ

**Xülasə**

Məqalədə epidemiologiyanın təbabət elmində, xüsusilə yoluxucu xəstəliklər və peşə xəstəlikləri sahəsində əhəmiyyətinə dair qısa məlumatlar verilmiş və son illər bu xəstəliklərin öyrənilməsi üzrə əldə edilən uğurlar və təcrübə paylaşılmışdır. Epidemiologiya sahəsində elmi yeniliklər təbabət elmini xeyli zənginləşdirmiş, təcrübi səhiyyədə yoluxucu xəstəliklərə qarşı mühüm tədbirlərin təklif edilməsi isə bu xəstəliklərin qarşısının alınması sayəsində minlərlə insan həyatının qorunması ilə nəticələnmişdir. Epidemiologiyanın qarşısında duran vəzifələr daima genişlənir, onlar insan cəmiyyətinin sosial-iqtisadi şərtlərinin təsiri altında, həmçinin yoluxucu patologiyaların artması sayəsində dəyişir. Epidemiologiya ümumi tibb elmi kimi əhalinin xəstələnməsinin aydınlaşdırılmasının səbəblərini, şərtlərini və mexanizmini, onun ərazi üzrə, müxtəlif əhali qrupları arasında və məkan daxilində yayılmasını öyrənir.

***Açar sözlər:*** *epidemiologiya, profilaktika, qeyri-infeksion xəstəliklər, diaqnostika, yoluxucu xəstəliklər, epidemioloji aspektlər, epidemioloji nəzarət*

**Ibadulla Aghayev**
Azerbaijan Medical University
Doctor of Medical Sciences
amuepid@mail.ru
**Khatira Khalafli**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
khalafli@mail.ru

**Maharram Niftullayev**
Azerbaijan Medical University
Doctor of Medical Sciences
mniftullayev@gmail.com
**Javanshir Rahimov**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
javanshir.rahimov@mail.ru
**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com

# Importance of epidemiology for medical science and health

## Abstract

In the article, brief information on the importance of epidemiology in medical science, especially in the field of infectious diseases and occupational diseases was given, and the successes and experience gained in the study of these diseases in recent years were shared. Scientific innovations in the field of epidemiology have greatly enriched the medical science, and the proposal of important measures against infectious diseases in experimental health care has resulted in the protection of thousands of human lives due to the prevention of these diseases. The tasks facing epidemiology are constantly expanding, they change under the influence of the socio-economic conditions of human society, as well as due to the increase of infectious pathologies. Epidemiology, as a general medical science, studies the causes, conditions, and mechanisms of public illness, its distribution across the territory, among different population groups, and within space.

***Keywords:*** *epidemiology, prevention, non-infectious diseases, diagnostics, infectious diseases, epidemiological aspects, epidemiological control*

## Giriş

Epidemiologiyanın təbabət elmində, xüsusilə yoluxucu xəstəliklər və peşə xəstəlikləri sahəsində əhəmiyyəti böyükdür. Epidemiologiya sahəsində elmi yeniliklər təbabət elmini xeyli zənginləşdirmiş, təcrübi səhiyyədə yoluxucu xəstəliklərə qarşı mühüm tədbirlərin təklif edilməsi isə bu xəstəliklərin qarşısının alınması sayəsində minlərlə insan həyatının qorunması ilə nəticələnmişdir. Epidemiologiya elminin əldə etdiyi nailiyyətlərdən biri dünya miqyasında təbii çiçəyin ləğv edilməsidir. Vaxtilə milyonlarla insanın ölümünə səbəb olan təhlükəli vəba və taun xəstəlikləri epidemiologiya elminin təklif etdiyi tədbirlər nəticəsində bir çox ölkələrdə yox dərəcəsinə endirilmişdir. Uşaqlar arasında ömürlük əlilliyə səbəb olan poliomielit xəstəliyi qısa müddət ərzində dünya miqyasında epidemiyalardan tək-tək xəstələnmə dərəcəsinə endirilmişdir (Ağayev, 2020: 134).

Epidemiologiya ümumi tibb elmi kimi əhalinin xəstələnməsinin aydınlaşdırılmasının səbəblərini, şərtlərini və mexanizmini, onun ərazi üzrə, müxtəlif əhali qrupları arasında və məkan daxilində yayılmasını öyrənir. Hazırda yoluxucu xəstəliklərin siyahısının azalmasını söyləmək olmaz, çünki həqiqətdə yeni infeksiyalar daima meydana çıxır, lakin onlar heç də həmişə vaxtında aşkar edilmir və bəzən gizli, latent şəkildə sürür. Tibb tarixində yeni xəstəliklərin, lakin etioloji mənşəyi bəlli olmayan və böyük əraziləri əhatə etmiş, sonra yox olmuş xəstəliklərin əmələ gəlməsi halları məlumdur. Son illər bütün xəstəliklərin populyasiya səviyyəsində öyrənilməsinin ümumi prinsipləri və metodiki əsasları işlənib hazırlanmışdır. Bu məqsədlə epidemiologiya terminindən geniş istifadə olunur. Bakterioloji kəşflərdən sonra bir əsrlik inkişaf dövründə epidemiologiya – epidemik prosesin qanunauyğunluqlarını öyrənən bir elm kimi formalaşmışdır. Epidemiologiyanın epidemiya haqqında elm kimi formalaşması qədim təbabətin yaranması dövrü ilə eyni vaxta təsadüf edir (Ağayev, 2022: 62).

Əsrimizin taunu adlandırılan viruslar tərəfindən törədilən insanın qazanılmış immunçatışmazlıq sindromu (QİÇS) xəstəliyi epidemiologiya elmi tərəfindən əvvəlcədən proqnozlaşdırma yolu ilə

aydınlaşdırıldı, sonra isə ona qarşı mübarizə tədbirləri işlənib hazırlandı. Epidemiologiya elminin mütərəqqi üsulları müasir təbabətdə somatik xəstəliklərlə mübarizədə geniş istifadə edilir. Bu xəstəliklər sırasında bədxassəli şişlər və ürək-qan damar sistemi xəstəlikləri ilə mübarizədə epidemiologiya elmindən daha geniş istifadə edilir (Ağayev, 2022: 35).

Məlum olduğu kimi, epidemiologiya ümumi tibb elmi kimi əhalinin xəstələnməsinin aydınlaşdırılmasının səbəblərini, şərtlərini və mexanizmini, onun ərazi üzrə, müxtəlif əhali qrupları arasında və məkan daxilində yayılmasını öyrənir. Başqa sözlə, epidemiologiya konkret əhali qruplarında infeksion və qeyri-infeksion xəstəliklərin yayılmasının xüsusiyyətlərinin və tezliyinin öyrənməsi ilə məşğuldur (Ağayev, 2020: 132). Epidemiologiyanın qarşısında duran vəzifələr daima genişlənir, onlar insan cəmiyyətinin sosial-iqtisadi şərtlərinin təsiri altında, həmçinin yoluxucu patologiyaların artması sayəsində dəyişir. Bəşəriyyət daima yoluxucu xəstəliklərin yeni növdəyişkən törədicilərin "təcavüzünə" məruz qalır. Hazırda yoluxucu xəstəliklərin siyahısının azalmasını söyləmək olmaz, çünki həqiqətdə yeni infeksiyalar daima meydana çıxır, lakin onlar heç də həmişə vaxtında aşkar edilmir və bəzən gizli, latent şəkildə sürür (Ağayev, 2022: 48). Tibb tarixində yeni xəstəliklərin, lakin etioloji mənşəyi bəlli olmayan və böyük əraziləri əhatə etmiş, sonra yox olmuş xəstəliklərin əmələ gəlməsi halları məlumdur. Bundan başqa, naməlum törədicilərlə törədilən, lakin ÜST siyahısına düşməyən yeni infeksiyaların aşkarlanması halları da məlumdur. Müasir dövrdə koronavirus, İİV-infeksiya, vərəm, malyariya, Ebola virusu ilə törədilən hemorragik qızdırma liderlik edən nozoloji formalardan sayılır. Hazırda "kosmopolitik" yoluxma mexanizmi ilə yayılan yoluxucu xəstəliklər geniş yayılmışlar və heç bir coğrafi sərhəd tanımırlar. İmmunprofilaktika vasitələri ilə idarə olunmayan xəstəliklər qlobal miqyasda yayılmışlar (Xələfli, 2021: 39).

Epidemiologiyanın maraq dairəsinə törədicinin təbiətdə saxlanması, kollektiv immunitetin formalaşması, insanların fəaliyyətinin infeksiyanın yayılmasına təsiri, yoluxucu xəstəliklərin təkamülü və yeni törədicilərin yaranması kimi məsələlər daxildir. Bəşəriyyət tarix boyu kütləvi, bəzən isə dağıdıcı yoluxucu xəstəliklərlə qarşılaşmışdır. Müəyyən illərdə insanların yoluxucu xəstəliklərdən ölüm göstəricisi 70 %-ə çatmışdır. Yoluxucu xəstəliklərin vurduğu zərəri təsəvvürə gətirmək üçün təkcə onu demək kifayətdir ki, 1918-1919-cu illərdə qrip pandemiyası dövründə dünyada 20 mln. insan məhv olmuşdur. İqtisadi cəhətdən geri qalmış, inkişaf etməkdə olan ölkələrdə ölümün səbəbləri içərisində əvvəlki kimi infeksiyaların xüsusui çəkisi yüksəkdir (Ağayev, 2022: 128).

Yoluxucu xəstəliklər bu günə qədər səhiyyənin aparıcı problemi olaraq insanların sağlamlığını, yaşama müddətini və ölümün səbəblərini müəyyən edir. Digər xəstəliklərlə müqayisədə yoluxucu xəstəliklər planetin əhalisi arasında dünyada ikinci-üçüncü yerdə durur. Məlumdur ki, istənilən xəstəliyin nozoloji müstəqilliyi etioloji agentlə müəyyən olunur. Əlbəttə, yoluxucu xəstəliklərlə mübarizədə nəzərə çarpacaq müvəffəqiyyətlər çoxdur. Məsələn, qızılcaya qarşı peyvənd alınmasından əvvəl dünyada hər il 135 mln. xəstələnmiş uşaqdan 7-8 mln.-u, hal-hazırda isə ildə 42 mln.-dan yalnız 1 mln.-u məhv olur. Planlı şəkildə aparılan profilaktik tədbirlər sayəsində poliomielit, drakunkulyoz (rişta) xəstəliklərinin tam ləğv olunması və artıq ciddi problem yaratmayan cüzam ilə mübarizə məsələləri reallaşmışdır. Keçmişdə geniş yayılan taun, vəba, təbii çiçək, səpgili və qarın yatalağı, difteriya, malyariya, qrip və digər xəstəliklərin pandemiya və epidemiyası keçən minillikdə yüz milyonlarla insanların ölümünə səbəb olmuşdur. XX əsrin əvvəlində yüksək xəstələnmə səviyyəsində ölüm halları taunda – 65-100 %, vəbada – 45 %, səpgili və qarın yatalağında – 25-40 % təşkil etmişdir **(**Bhopal, 2003: 45).

Lakin xəstəliklərin diaqnostikası və müalicəsində əldə olunan müvəffəqiyyətlərə baxmayaraq, infeksion xəstəliklər insanın mühüm patologiyası olaraq qalmaqdadır: həkimə müraciət edən hər ikinci pasiyent – yoluxucu xəstəliklərlə yoluxmuş şəxslərdir, sahə pediatrlarının pasiyentlərinin 70 %-i yoluxucu xəstəliklərdən əziyyət çəkən uşaqlardır.

Yoluxucu xəstəliklərin ləğv edilməsi tibb elminin mürəkkəb problemlərindəndir. Amerikanın Boston şəhərində yerləşən Harvard Universitetinin profilaktik təbabət və epidemiologiya kafedrasının professoru Qordon qeyd edir ki, "xəstəliyin ləğv edilməsi o deməkdir ki, yer kürəsinin heç bir yerində yenidən baş verməsin. Xəstəlik yalnız bütün dünyada ləğv edildikdən sonra ona qarşı profilaktik tədbirləri dayandırmaq olar" (Gordis, 1996: 89).

Deyildiyi kimi, yoluxucu xəstəliyin nozoloji növ kimi ləğv edilməsi (devastasiya) törədicinin bioloji növ kimi qlobal miqyasda məhv edilməsi (eradikasiya) ilə təmin edilir. Yoluxucu xəstəliyin qlobal ləğv edilməsi onun regional ləğv edilməsi ilə başlanır. Yoluxucu xəstəliyin regional ləğv edilməsi ərazi daxilində törədicinin məhv edilməsi (eliminasiya) və bir daha bu ərazidə gətirilmə törədicinin inkişafının qarşısının alınması yolu ilə mümkündür (Murray, 1997: 76).

Müasir infeksion epidemiologiyanın 3 başlıca məqsədi vardır:

1) xəstəliklərlə (sağlamlıqla) bağlı problemlərin ölçüsünü və yayılmasını təyin etmək yolu ilə səhiyyə xidmətinin inkişafını istiqamətləndirmək,

2) bu xəstəliklərlə mübarizə aparmağa imkan verən və ya onlara təsir göstərən etioloji (səbəbiyyət) və digər amilləri aşkar etmək,

3) xəstəliklərlə mübarizə və cəmiyyətin sağlamlığının yaxşılaşdırılması məqsədilə həyata keçirilən tədbirlərin effektivliyinin təyin edilməsi metodunu işləyib hazırlamaq.

Ümumdünya Səhiyyə Təşkilatının (ÜST) rəhbərliyi altında dünyanın bir çox ölkələrinin səyi nəticəsində dünya miqyasında təbii çiçək xəstəliyi ləğv edilmişdir. Uzun müddətdir ki, təbii çiçək xəstəliklər sırasından çıxarılmış və ona qarşı profilaktik tədbirlər dayandırılmışdır.

ÜST tərəfindən üçgünlük malyariyanın ləğvi proqramı hazırlanmış və dünya miqyasında həyata keçirilir. Ancaq bu tədbirlər nəticəsində malyariya parazitinin məhv edilməsi hələlik mümkün olmamışdır. Hazırda tropik və subtropik ərazilərdə ÜST-ün malyariyanın qarşısını almaq proqramı geniş miqyasda yerinə yetirilir.

Müasir dövrdə bir çox təhlükəli yoluxucu xəstəliklərin (vəba, taun, viruslu gənə ensefaliti və s.) ləğv edilməsi mümkündür, ancaq onun həyata keçirilməsi bir çox dünya ölkələrinin iştirakı və ÜST-ün rəhbərliyi altında aparılarsa, müəyyən müddətdə buna nail olmaq olar. Lakin bu, çox mürəkkəb işdir və ancaq külli vəsait qoyuluşu onun gerçəkləşməsinə zəmanət verə bilər (Kundapur, 2022: 56).

Biologiya elmində ümumilikdə (təbabət – biologiya elminin hissəsidir) və epidemiologiyada mövcud nəzəriyyələr arasında, hər şeydən əvvəl, Y. N. Pavlovski tərəfindən işlənmiş yoluxucu xəstəliklərin təbii-ocaqlılıq nəzəriyyəsi və L. V. Qromaşevski tərəfindən verilmiş antroponoz infeksiyaların törədicilərinin yoluxma mexanizmi nəzəriyyəsi xüsusi rol oynayır. XX əsrin ikinci yarısından etibarən qeydə alınan yoluxucu xəstəliklərin strukturu kəskin yüksəkkontagioz manifest formaların xüsusi çəkisinin azalması və xronik, hospital, ləng inkişaf edən, sapronoz və şərti-patogen törədicilərlə şərtlənən xəstəliklərin xüsusi çəkisinin artması şəklində özünü göstərir ki, bu da əksepidemik tədbirlərin effektivliyinin aşağı olması və "qayıdan infeksiyalar" probleminin yaranması ilə bağlıdır. Bütün bunlar L. V. Qromaşevskinin "triada" konsepsiyasına dair baxışların dəyişdirilməsini tələb edir (Ağayev, 2022: 176).

Toplanmış faktlar əksepidemik fəaliyyət konsepiyasının yenidən işlənməsini və hər şeydən əvvəl bir sıra nəzəri və təcrübi məsələlərin həll edilməsini tələb edir:

1) kollektivdə yaranan gətirilmə xəstəliklərin spesifik törədicilərin dövranı sayəsində baş verən xəstəliklərin diferensiasiyasının mürəkkəbliyi;

2) tək-tək və çoxsaylı xəstələnmə ocaqlarının məhdudlaşdırılmasında meydana çıxan çətinliklər və şərtiliklər, həmçinin epidemik ocağın mövcudolma müddətinin, təbdirlərin həcmi, onların aparılması və başa çatdırılması müddətlərinin təyin edilməsi;

3) klinik-epidemioloji proqnozun kəmiyyət və keyfiyyət meyarlarının olmaması və ya aşağı informativliyi, həmçinin ekoloji proqnozlaşdırmanın vahid sisteminin yaradılmasının zəruriliyi.

Bu kimi bir sıra məsələlərin həlli V. D. Belyakov tərəfindən işlənib hazırlanmış parazitar sistemlərin özünütənzimləmə nəzəriyyəsi ilə bağlıdır. Parazitar sistemlərin özünütənzimləmə nəzəriyyəsi epidemiologiyanın bir elm kimi inkişafında yeni addım idi. Onun sayəsində elmi və təcrübi epidemiologiya ümumtibb elmi səviyyəsinə qalxdı və profilaktik səhiyyənin həqiqi diaqnostik fənninə çevrildi.

Yoluxucu xəstəliklərin ləğv edilməsi problemi epidemiya əleyhinə tədbirlərin əsasında həll ola bilər. Parazitar sistemin özünütənzimləmə nəzəriyyəsi bu problemin anlaşılmasına böyük yenilik gətirir (Belyakov, 1989).

Nəzəri baxımdan yoluxucu xəstəliklərin ləğv edilməsinə epidemiya əleyhinə tədbirlərin aparılması ilə nail olmaq olar. Epidemiya əleyhinə tədbirlərin əksəriyyəti xəstəliklərin qarşısının alınmasına

yönəldilib. Törədiciyə bioloji növünü saxlamaq üçün hökmən bir mərhələdən başqa mərhələyə fasiləsiz keçməsi vacibdir. Bununla yanaşı, yoluxucu xəstəliyin ləğv edilməsi mərhələsində klinik-diaqnostik tədbirlərin (məsələn, peyvənd) çox yüksək səviyyədə aparılması lazımdır. Yoluxucu xəstəliklərin ləğv edilməsi hipodiaqnostikaya meylin olması, xəstəlik göstəricilərinin süni şəkildə aşağı salınması ilə mümkün deyildir. Bu və ya digər yoluxucu xəstəliklərin ləğv edilməsi təkcə xəstəliyin yayılmasının qarşısını almaqla deyil, eyni zamanda epidemik prosesin başqa həssas mexanizminə təsir etməklə müəyyən edilir (Khalequzzaman, 2017: 154).

Yoluxucu xəstəliklərin ləğvi müəyyən yoluxucu xəstəliyin ölkə və ya bir sıra ölkələrin hüdudlarında, yaxud bütün yer kürəsində həmin xəstəliyin törədicisinin tam məhv edilməsi və ya yox olması ilə müşayiət olunan ləğvini nəzərdə tutur. Bu, xaricdən törədici gətirilməməklə müəyyən ərazidə əhali arasında ləğv olunan infeksiyanın hər hansı bir formada baş vermə ehtimalını istisna edir (Vahle, 2016: 69).

Antroponozlar zamanı yoluxucu xəstəliklərin ləğvi dedikdə, müəyyən ərazidə törədicinin dövr etməsinin tam dayandırılması başa düşülür (Vuorimies, 2017: 26). Zoonozlar zamanı heyvanlarda müvafiq xəstəliklər aşkar edildikdə, insanların xəstələnməsinə yol verilməməsi vacibdir, buna ya spesifik profilaktika, ya da təbii ocaqların ləğv edilməsi yolu ilə nail olmaq mümkündür (Agaba, 2019: 78).

## Nəticə

Müasir şəraitdə yoluxucu xəstəliyin tam ləğvi üçün həmin infeksiyanın epidemik prosesini tamamilə qırmağa və bununla da, xəstəliyin ləğvini təmin etməyə, həmçinin onun törədicisini məhv etməyə qadir yüksək effektiv vasitələr lazımdır.

Ebola virusu ilə törədilən hemorragik qızdırma liderlik edən nozoloji formalardan sayılır. Hazırda "kosmopolitik" yoluxma mexanizmi ilə yayılan yoluxucu xəstəliklər geniş yayılmışlar və onlar heç bir coğrafi sərhəd tanımırlar. İmmunprofilaktika vasitələri ilə idarə olunmayan xəstəliklər qlobal miqyasda yayılmışlar. Yeni infeksiyaların yaranması və yayılması əvvəllər rast gəlməyən infeksiyaların endemik ərazilərdən digər ərazilərə gətirilməsinə səbəb olur. Bunun nəticəsində yoluxucu xəstəliklər dünya ölkələrində həm xəstələnmə səviyyəsinə, həm də coğrafi aspektlər baxımından qeyri-bərabər paylanmışdır.

## Ədəbiyyat

1. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. (2020). Azərbaycanda infeksion xəstələnmənin yekun göstəricilərinin qiymətləndirilməsi. Azərbaycan tibb jurnalı.
2. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. (2022). Epidemiologiya (Milli rəhbərlik). Bakı.
3. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. (2022). Qeyri-infeksion xəstəliklərin epidemiologiyası. Bakı.
4. Xələfli, X. N., Vəkilov, V. N. (2021). Əhalinin sanitar-epidemioloji salamatlığının idarə edilməsinin mexanizmi. Azərbaycan Tibb Universitetinin 90 illik yubileyinə həsr olunmuş "Saglam əmək və həyat təhlükəsizliyi" mövzusunda elmi-praktik konfransın materialları toplusu. Bakı.
5. Bhopal, R. (2003). Concepts of Epidemiology. NY: Oxford University Press.
6. Gordis, L. (1996). Epidemiology. Philadelphia: Sounders.
7. Murray, C. J., Lopez, A. D. (1997). Alternative projections of mortality and disability by course 1990-2020: Global burden of disease study. Lancet.
8. Kundapur, B., Modi Shenoy, P. (2022). I activity adaptation towards control of selected noncommunicable diseases – A detailed part of large community trial in rural areas of India. J Fam Med Prim Care.
9. Khalequzzaman, M., Chiang, C., Hoque, B. A. (2017). Population profile and residential environment of an urban poor community in Dhaka, Bangladesh. J. Environ Health Prev Med.
10. Vahle, J. L. (2016). Skeletal Changes in Rats Given Daily Subcutaneous Injections of Recombinant Human Parathyroid Hormone (1-34) for 2 Years and Relevance to Human Safety. Toxicol Pathol.

11. Vuorimies, I. (2017). Bisphosphonate Treatment and the Characteristics of Femoral Fractures in Children With Osteogenesis Imperfecta. J Clin Endocr Metab.
12. Agaba, E. I., Akanbi, M. O., Agaba, P. A. (2019). A survey of non-communicable diseases and their risk factors among university employees: a single institutional study. South African Journal of Diabetes and Vascular Disease.

Göndərilib: 16.03.2024 Qəbul edilib: 24.05.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/126-131

**Flora Tağıyeva**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
flora-tagiyeva@mail.ru
**Cavanşir Rəhimov**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
javanshir.rahimov@mail.ru
**Şahin Süleymanov**
Azərbaycan Tibb Universiteti
tibb xidməti polkovniki
department_medical_prophylaxis@amu.edu.az
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com
**Pəri İsaqova**
Azərbaycan Tibb Universiteti
isagovap@mail.ru

# TRAVMATİZM – QEYRİ-İNFEKSİON XƏSTƏLİK KİMİ

**Xülasə**

Travmatizm ciddi tibbi-sosial problem təşkil edir. Bioloji və sosial amillərdən asılı olan travmatizmin populyasiyada geniş yayılmış patologiya kimi öyrənilməsini epidemioloji diaqnostika metodlarından istifadə etməklə aparılması məqsədəuyğundur. Bu zaman epidemioloji diaqnostikanın predmeti travmatizmə məruz qalan bütün əhali qrupu, yəni bütün əhali sayılır.

Əhalinin xəstələnməsinin və ölümünün çoxsaylı səbəbləri arasında travmalar patologiyanın bir növü kimi son dərəcə aktual əhəmiyyət kəsb etmişdir. Belə ki, dünyanın inkişaf etmiş ölkələrinin əhalisi arasında birincili əlilliyin və ölümün bütün səbəbləri arasında travmalar üçüncü yer (şiş və ürək-damar xəstəliklərindən sonra), əmək qabiliyyətli yaşda olan şəxslərdə isə ölümün səbəbləri arasında birinci yerdə dayanır. Travmalar gənc yaşlı şəxslərin (uşaqlar, yeniyetmələr, gənclər) patologiyasında üstünük təşkil edir. Travmatizmin ən yüksək səviyyəsi kişilərdə 20-49 yaşda, qadınlarda isə 30-59 yaşda qeydə alınır, bu zaman bütün yaş qruplarında bu göstərici kişilərdə xeyli yüksəkdir. Kişi əhalisi arasında 15-30 yaşda travmalar xəstələnmənin, əlilliyin və ölümün başlıca səbəbidir.

***Açar sözlər:*** *travmatizm, istehsalat, məişət, küçə, məktəb, idman travmaları*

**Flora Taghiyeva**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
flora-tagiyeva@mail.ru
**Javanshir Rahimov**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
javanshir.rahimov@mail.ru
**Shahin Suleymanov**
Azerbaijan Medical University
Medical Service Colonel
department_medical_prophylaxis@amu.edu.az

**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com
**Peri Isagova**
Azerbaijan Medical University
isagovap@mail.ru

# Traumatism as a non-infectious disease

## Abstract

Traumatism is a serious medical and social problem. It is appropriate to study traumatism, which depends on biological and social factors, as a widespread pathology in the population, using epidemiological diagnostic methods. At this time, the subject of epidemiological diagnostics is considered to be the entire population group exposed to trauma, that is, the entire population.

Among the numerous causes of illness and death of the population, traumas have become extremely important as a type of pathology. so that among the population of the developed countries of the world, among all the causes of primary disability and death, traumas take the third place (after tumors and cardiovascular diseases), and among people of working age, traumas take the first place among the causes of death. They predominate in the pathology of young adults (children, adolescents, young people). The highest level of traumatism is recorded in men aged 20-49 years, in women 30-59 years, while this indicator is much higher in men in all age groups. Among the male population, traumas at the age of 15-30 are the main cause of morbidity, disability and death.

***Keywords:*** *traumatism, industrial, domestic, street, school, sports traumas*

## Giriş

Hazırda qeyri-infeksion xəstəliklərin epidemiologiyası (QİXE) tibb elmində özünəməxsus yer tutmuşdur. Belə ki, hər il qeyri-infeksion xəstəliklərdən (QİX) 41 milyon şəxs ölür ki, bu da dünyada baş verən bütün ölüm hadisələrinin 71 %-ni təşkil edir. QİX-nin epidemiologiyasının başlıca vəzifələri risk qruplarının, risk vaxtının, risk ərazilərinin aşkar edilməsi və risk amillərinin təyin edilməsindən ibarətdir (Belyakov, 1989: 25). Əhalinin altqruplarında xəstələnmənin müqayisə edilməsini nəzərdə tutan epidemioloji yanaşma istənilən patologiyanın yaranması səbəblərinin öyrənilməsində geniş istifadə edilmiş və hazırda da tətbiq edilir (Zuyeva, 2006: 650). QİXE-nin tədqiqat obyektlərindən biri də travmalardır.

Travmatizm – konkret zaman kəsiyində müəyyən əhali qrupunda meydana çıxan travmaların məcmuyu kimi müəyyən edilir və 1 ay və il ərzində 100, 1000 nəfərə düşən travmaların sayı ilə hesablanır.

Xəstəliklərin, travmaların və ölüm səbəblərinin beynəlxalq təsnifatına görə, travmalar 2 cür təsnif edilirlər: bədbəxt hadisələrin, zəhərlənmələrin və travmaların səbəblərinə görə, zədələnmələrin lokalizasiyasına görə (cəmi 199 qrafa). Ölkəmizdə həmçinin travmalar istehsalat (sənaye, kənd təsərrüfatı, tikinti, nəqliyyat və s.) və qeyri-istehsalat (məişət, küçə, yol-nəqliyyat, idman, məktəb və s.) travmalarına bölünürlər (Briko, 2013: 28).

*İstehsalat travmatizmi* – istehsalat travmalarının məcmuyunu xarakterizə edən vəziyyətdir. İstehsalat travmatizminə aiddir: istehsalatda baş verən bədbəxt hadisə – işçi ilə baş verən hadisə (təhlükəli istehsalat amilinin ona təsir etməsi ilə bağlı olan); istehsalat travması – işçinin istehsalatda aldığı və əməyin təhlükəsizliyi qaydalarının gözlənilməməsi nəticəsində qazanılan travma (Briko, 2013: 78).

*Məişət travmaları* – zərərçəkənin istehsalat fəaliyyətindən kənarda – evdə, mənzildə, həyətdə və s. meydana çıxan bədbəxt hadisələrdən ibarətdir.

*Yol-nəqliyyat travmaları* – zərərçəkənlərin istehsalat fəaliyyəti ilə bağlı olmayan hallarda müxtəlif növ nəqliyyat vasitələri tərəfindən onların istifadəsi (hərəkəti) zamanı yetirilən travmalar olub, zərərçəkənin hadisə olan anda nəqliyyat vasitəsində (sürücü, sərnişin) və ya ondan kənarda

(piyada) olmasından asılı olmayaraq baş verən travmalardır. Yüklərin, əşyaların, insanların daşınması üçün istifadə edilən istənilən vasitə nəqliyyat vasitəsi sayılır.

*Küçə travmaları* – zərərçəkənlər tərəfindən istehsalat fəaliyyətindən kənarda – küçədə, açıq ictimai yerlərdə, tarlada (çəməndə), meşədə və s. onları yaradan səbəbdən asılı olmayaraq (nəqliyyat vasitələrinin təsirindən başqa) qazanılan travmalardır (Vtert, 1990: 248).

*Məktəb travmaları* – özündə bütün tip (o cümlədən musiqi, idman, texniki peşə məktəbləri) gündüz ümumtəhsil məktəblərinin şagirdlərində onların məktəbdə (dərsdə, o cümlədən bədən tərbiyəsi dərslərində, fasilədə, tədris emalatxanalarında, məktəbyanı sahələrdə) olduqları dövrdə baş verən bədbəxt hadisələri cəmləşdirir.

*İdman travmaları* – müəllimin və ya məşqçinin nəzarəti altında idmanla məşğul olduqda (stadionda planlı, qrupşəkilli və ya fərdi məşğələlər, idman bölməsində, idman meydançasında) baş verən bədbəxt hadisələr hesab edilir.

*Digər travmalara* yuxarıdakı növlərə aid edilməyən bütün hadisələr daxildir.

Yuxarıda göstərilən təsnifat travmaların qarşısının alınmasının əsas istiqamətlərini müəyyən edir. Travmaların qazanılması şəraitinin daha ətraflı öyrənilməsi travmatizmin profilaktikası üzrə konkret yolların və mübarizə tədbirlərinin işlənib hazırlanmasına imkan verir (Pokrovskiy, 2006: 36).

Travmatizmin uçotu hər bir travmatizm hadisəsi üçün statistik talonun doldurulması yolu ilə həyata keçirilir ki, onun əsasında müalicə-profilaktika müəssisələrində "ilk dəfə aşkar edilmiş zəhərlənmə və travmaların bədbəxt hadisələrinin uçotunun ümumi siyahısı" tərtib edilir. Travmatizm barəsində dürüst və tam məlumat – onun effektiv profilaktikasının mütləq şərtidir.

Travmatizmin səviyyəsinin azaldılması üçün istehsalat və qeyri-istehsalat travmalarının bütün səbəblərinin uçota alınması və təhlil edilməsi, travmaların xarakterinə və lokalizasiyasına, şəraitlərinə görə bölünməsi çox vacibdir ki, bu, risk amillərinin təsir dərəcəsinin azaldılması üzrə məqsədyönlü tibbi, sanitar-gigiyenik tədbirlərin işlənib hazırlanması, əhalinin özünə və bir-birinə (qarşılıqlı) yardım üsullarının öyrədilməsi, əhalinin gigiyenik tərbiyəsi və sağlam həyat tərzinin təşviqi, travmatizmin bütün növlərinin azaldılması üzrə tədbirlərin yerinə yetirilməsinə nəzarətin aparılması üçün lazımdır.

Həkimlərin əsas vəzifələri bütün travma hadisələrinin dəqiq qeydə alınmasından ibarət olub, bu zaman travmanın alınması səbəbənin mütləq göstərilməsi, zərərçəkənin hər bir müraciəti zamanı informasiyanın verilməsi vacibdir (Zuyeva, 2005: 133).

Təqdim olunan məlumatlardan göründüyü kimi, Rusiya Federasiyasında (RF) həm kişilərdə, həm də qadınlarda travma səbəbi ilə ölüm səviyyəsinin vəziyyəti daha faciəvidir. Travmatizasiya ilə şərtlənmiş ölüm göstəricisi Rusiyada kişilərdə 100 min əhaliyə görə 505 nəfər, qadınlarda isə 100 min əhaliyə 106 nəfər təşkil edir. RF-də iri meqapolisdə travmaların sayı ildə 500 mindən çox olur. Belə ki, Sankt-Peterbuq əhalisini arasında dayaq-hərəkət aparatının travmalarının tezliyi 1995-2000-ci illər ərzində orta hesabla 10 min əhaliyə görə 684,3 təşkil etmişdir. Cəmi son onillikdə ölkənin müalicə müəssisələrinə hər il travmalardan zərər çəkən 12 mln.-dan çox şəxs müraciət etmişdir (Ağayev, Xələfli, Tağıyeva, 2012: 728).

Ölkə əhalisinin ümumi xəstələnməsinin strukturunda travmalar və onların fəsadları 4-cü yeri, müvəqqəti əmək qabiliyyətini itirmənin səbəbləri arasında isə birinci yeri tuturlar, həmçinin birincili əlilliyin səbəbi olmaqla əlilliyə gətirib çıxaran bütün səbbələrin arasında dördüncü yer tuturlar. Əmək qabiliyyətli əhalinin ölümünün səbəbləri arasında travmalar birinci yer tuturlar. ÜST-nin Avropa Regional Bürosunun qərarına əsasən (1995-ci il), travma xəstəliyi keçmiş sosialist ölkələrinin sosial-iqtisadi və siyasi böhranların ən ağır fəsadlarından biridir.

İnkişaf etmiş bütün ölklərin, o cümlədən RF-nin əhalisinin travmatizasiyasının tezliyinin çoxillik dinamikası durmadan artması ilə səciyyələnir. Rusiya Federasiyasında travmaların sayının hər il artması 1,5-2 %-dən aşağı deyildir, bu, ilk növbədə, yol-nəqliyyat və məişət travmalarının sayının artması nəticəsində baş verir.

Travmatizasiyanın tezliyinin aylar üzrə dəyişməsi dinamikası iri meqapolisin əhalisinin timsalında göstərilmişdir. Bir çox illər üzrə əhalinin travmatizasiyasının tezliyinin aylar üzrə

paylanmasının təhlili zamanı ilin ayları üzrə onun qanunauyğun şəkildə dəyişməsi müəyyən edilmişdir (Zuyeva, 2006: 548).

Travmatizasiyanın tezliyinin pik qiymətləri yanvar və may aylarına təsadüf edir. Həmçinin qeyd edilmişdir ki, yay dövründə yaraların və zədələnmələrin faizi artır, qış aylarında isə aşağı ətrafların sınıqlarının xüsusi çəkisi yüksəlir. Mayda artımı, çox güman ki, bağ mövsümünün başlanması – həyətyanı torpaq sahələrində iş və bu dövrdə baş verən travmatizasiya ilə izah etmək olar, yanvarda isə şəhər sakinlərinin yollar və küçə səkiləri ilə hərəkətlərinə mane olan yerin buz bağlaması (sürüşkən olması) və digər pis hava şəraiti nəticəsində meydana çıxan travmalar kütləvi xarakter alır.

Əhalinin müxtəlif qrupları arasında travmaların və onların fəsadlarının yayılması, strukturu barəsində epidemioloji məlumatların öyrənilməsi həm travmatizmin yaranmasının xarici səbəblərinin, həm də onların tibbi və sosial-iqtisadi fəsadlarının profilaktikası üzrə tədbirlərin işlənib hazırlanması üçün vacibdir (Bigkhol, 1994: 242). Travmalar zamanı əhaliyə göstərilən yardımın təkmilləşdirilməsi üzrə təşkilati tədbirlərin planlaşdırılması zamanı bu patologiyanın epidemiologiyasına dair: əhali arasında onun tezliyi, yayılması, onun ayrı-ayrı formalarının strukturu, ətraf mühitin mühüm amilləri ilə əlaqəsi barəsində məlumatlar mühüm əhəmiyyət kəsb edir ki, onlar elmi cəhətdən əsaslandırılmış profilaktikanın təşkili, zərərli amillərin təsirinin azaldılması, travmatoloji, neyrocərrahi və digər müalicə yardımlarının planlaşdırılması, təkmilləşdirilməsi məqsədi ilə aparılır. Epidemioloji tədqiqatlar proqnozların tərtibi, travmaların fəsadlarının profilaktikası, müalicəsi və azaldılması üzrə tədbirlərin effektivliyinin öyrənilməsinə xeyli köməklik edir. Əldə olunan məlumatların əsasında konkret şəhərdə travmalara gətirib çıxaran müxtəlif səbəblərdən zərərçəkənlərin gözlənilən sayını hesablamaq olar. Həmçinin ixtisaslı yardım növlərinin göstərilməsinə ehtiyacları olanların payını müəyyən etmək, travmalardan və onların fəsadlarından ölənlərin və hospitalizasiya olunanların gözlənilən sayını hesablamaq olar (Belyakov, Chaklin, 1986: 72-90).

Zərərçəkənlərin tibbi yardım üçün müraciətlərinin başlıca səbəbi ənənəvi olaraq o qədər də ciddi olmayan zədələnmələr – yumşaq toxumaların zədələri və yaralardır. Lakin digər qismini kifayət qədər ağır zədələr – sınıqlar, çıxıqlar, yanıqlar və donmalar təşkil edir. Tibbi yardımın göstərilməsi baxımından daha ağır və mürəkkəb olan – çoxsaylı (müştərək) travmalardır. Ümumilikdə çoxsaylı və müştərək travmaların payına bütün travmaların 1/5-dən çox hissəsi düşür.

*Müştərək travma* əsas etibarilə əmək qabiliyyətli yaşda olan əhalidə (80 %-ə qədər), xüsusilə də kişilərdə (60 %) müşahidə edilir və yüksək letallığa (35 %-ə yaxın) gətirib çıxarır. Əksər hallarda onun səbəbləri yol-nəqliyyat travmaları (50-60 %), yüksək hündürlükdən yıxılma (25 %), qəsdən (bilə-bilə yetirilən) travmalar (10 %-ə qədər) sayılır. Hər üçüncü pasiyent bu travmanı alkoqolla sərxoş vəziyyətdə alırlar. Meqapolisdə yol-nəqliyat hadisələri (YNH) nəticəsində müştərək travma alan pasiyentlər arasında piyadalar əhəmiyyətli dərəcədə (80 %-ə qədər) dominantlıq edirlər. Bu səbəbdən müştərək travmalar və letal nəticələrin ən ağır formaları məhz yol-nəqliyat hadisələri zamanı qeydə alınmışdır (Ağayev, 2020: 141).

Zədələnmənin ağırlıq dərəcəsinə görə *onurğa-bel travması* müştərək travmaya daha yaxındır. O, travmanın dominantlıq edən növü deyildir, lakin struktur zədələnmələrinin əhəmiyyətinin son dərəcə yüksək olması, onların fəsadlarının mürəkkəb və ağır olması, müalicənin çətin olması və zərərçəkənlərin ağır dərəcəli əlilliyinin qeydə alınması nəticəsində mühüm tibbi və sosial əhəmiyyət daşıyırlar.

Son illər istehsalın inkişaf etməsi, tikintidə, kənd təsərrüfatında mexanikləşdirmənin tətbiq edilməsi, istehsalın intensivləşdirilməsinin artması, nəqliyyat vasitələrinin inkişaf etməsi, urbanizasiya ilə əlaqədar onurğanın və onurğa beyninin zədələnmələrinin sayının artması meyli aydın nəzərə çarpır. Onurğa-spinal travmaların tezliyi barəsində statistik məlumatlar oxşar deyildir. Müxtəlif müəlliflər zədələnmələrin tezliyi və xarakteri barəsində fərqli məlumatlar verirlər. Ümumi travmatizmin strukturunda onurğanın travmalarının xüsusi çəkisi 1,7 %-dən 17,7 %-ə qədər təşkil edir (Ağayev, 2020: 135). Hesablamalara görə hər il hər 10 mln. sakindən 100-150 nəfərində onurğanın və onurğa beyninin zədələri baş verir. Bir çox müəlliflər tərəfindən onurğa-spinal

travmaların xüsusi çəkisinin durmadan artması (30 dəfə) qeydə alınır. Uzunmüddətli proqnozlara əsasən, gələcəkdə də onurğa-spinal travmatizminin artması müşahidə edilir. Müasir dövrdə aparılan hesablamalara görə, spinal travmatizmin son 70 il ərzində 200 dəfədən çox artması müşahidə olunur. Bu prosesin proqnozlaşdırılması çox yaxın gələcəkdə 10 mln. əhaliyə görə travmaya məruz qalanların səviyyəsinin 800 və daha çox çatacağını göstərir. Belə ki, Sankt-Peterburqda travmatizasiyanın tezliyinin məlumatlarına əsasən, hazırda 300-320 nəfər hər il ağırlaşmış onurğa-spinal travmaları (1 mln. əhaliyə görə 60-64 nəfər) alırlar ki, bu da 70-ci illərin ortalarındakı göstəricilərdən 4-6 dəfə yüksəkdir (Briko, 2013: 643).

Bu patologiyanın çoxplanlı olması böyük sayda ağırlaşmaların baş verməsinə şərait yaradır. Onuğa-onurğa beyni travmalarının nəticəsində hər il RF-da 8 mindən çox şəxs əlil (10 mln. əhaliyə görə 547 nəfər) olurlar. Lakin travmaya məruz qalanların həqiqi sayı əlillik qazanmış şəxslərin sayından xeyli çoxdur.

Digərlərindən fərqli olaraq spinal travma xüsusi tibbi-sosial əhəmiyyət kəsb edir, çünki bu travma zamanı cəmiyyətin və xəstənin yaxınlarının maliyyə, fiziki, maddi xərcləri ölçülməzdir. ABŞ-da belə bir pasiyentin başlanğıc müalicəsi 30 min dollara başa gəlir; təkcə onurğa beyninin zədələnmələri olan xəstələrdə yataq yarasının müalicəsinə il ərzində 66 mln. dollar sərf olunur. Spinal travmaya çəkilən illik xərc 2 mlrd. dollara çatır, belə ki, ABŞ-da spinal travma zəminində paraplegiya ilə 200 minə yaxın xəstə vardır. Hesablanmışdır ki, travmatik paraplegiya ilə bir xəstəyə qulluq və onların ömrünün sonuna qədər müalicəsi 500 min dollar maya dəyərinə başa gəlir (Iskakov, 2017).

Bir çox xəstələrdə onurğa beyninin zədələnməsi bütün orqan və toxumalarda ağır neyrodistrofik prosesin inkişaf etməsinə gətirib çırır. Yataq yaraları onurğa beyninin kobud zədələnmələri olan praktik olaraq bütün xəstələrdə əmələ gəlir. Epidemioloji tədqiqatların gedişində yataq yaralarının əlamətlərinin nevroloji pozulmaların ağırlıq dərəcəsindən birbaşa asılı olması aşkar edilmişdir. Bununla yanaşı xəstələr üzərində fərdi qulluğun əhəmiyyəti göstərilmişdir ki, bu da digər amillərlə yanaşı trofik pozulmaların tezliyini və ifadə dərəcəsini müəyyən edir. Yataq yaraları onurğa beyninin zədələnmələri olan 50-90 % xəstələrdə onların xəstəliyi boyunca əmələ gəlir. Məlumatların fərqlənməsi əsas etibarilə onurğa beyninin zədələnməsi səviyyəsindən asılıdır. Ədəbiyyatda yataq yaralarının yaranmasının çoxlu risk amilləri təsvir edilmişdir.

Əsas amillərə aiddir: onurğa beyninin zədələnməsinin ağırlıq dərəcəsi və səviyyəsi; həssaslığın pozulmasının səviyyəsi və xarakteri; xəstənin aktivliyi, ətraflarında iradi hərəkətlərin olmaması; çanaq orqanlarının funksiyasının pozulması.

İnfeksiyanın, xüsusilə hospitaldaxili formaların *Pseudomonas aeruginosa, Staphylococcus aureus* və *Proteus mirabilis* qoşulması ağır irinli proses törədir ki, bu, çox vaxt xəstələrin ölümünə gətirib çıxarır. Birinci Dünya müharibəsi dövründə yataq yaraları 83 % hallarda ölümcül nəticələrin səbəbi olmuşdur. Böyük Vətən müharibəsində yataq yaraları sepsisin əsas mənbəyi idi və 20 % hallarda ölümə gətirib çıxarırdı (Ağayev, 2022: 873). Müxtəlif müəlliflərin məlumatlarına əsasən, sülh dövründə yataq yaralarından 3 %-dən 9 %-ə qədər xəstə ölür.

*Kəllə-beyin travmaları (KBT*) onurğa-onurğa beyni travmaları ilə yanaşı ən mühüm tibbi və sosial problemlərdən biri sayılır. Onun xüsusi aktuallığını aşağıdakı amillər müəyyən edir: kəllə-beyin travmaları uşaq yaşlarında hospitalizasiya tələb edən bütün travmalar arasında birinci yeri tutur və ümumilikdə bütün uşaq travmalarının 35-40 %-ni təşkil edir. Belə ki, ÜST-nin məlumatlarına əsasən, neyrotravmanın tezliyinin ildə daima 1-2 % artması nəzərə çarpır, son onillikdə isə müxtəlif müəlliflərin məlumatlarına görə, neyrotravma uşaq ölümünün strukturunda birinci yer tutmağa başlamışdır. Müasir proqnozlara əsasən, yaxın onillikdə uşaqlarda KBT-nin tezliyinin və ağırlıq dərəcəsinin artması baş verəcəkdir; neyrotravma – uşaqlarda hidrosefaliyanın, epilepsiyanın, ağıl zəifliyinin və s. inkişaf etməsi ilə bərabər, ağır nevroloji və psixi pozulmaların əmələ gəlməsinin başlıca səbəblərindən biridir. Sənayenin və nəqliyyatın sürətlə inkişaf etməsi ilə əlaqədar olaraq, xüsusilə iri sənaye mərkəzlərində son onillikdə travmatizmin, o cümlədən KBT-nin səviyyəsi kəskin artmışdır. Ümumi statistik məlumatlara əsasən, KBT uşaq yaşlarında bütün travmaların strukturunda 21-55 % təşkil edir. KBT keçirmiş uşaqların 40-60 %-də müxtəlif rezidual

hallar qeydə alınır ki, onlar getdikcə şiddətlənən vegetativ pozulmalar, psixi və fiziki inkişafın ləngiməsi ilə təzahür edirlər. KBT üçün travmatik xəstəliyin kəskin dövründə yüksək ölüm göstəriciləri səciyyəvidir.

## Nəticə

Epidemioloji təhlil bu patologiyanın ümumi qanunauyğunluqlarını müəyyən etməyə imkan vermişdir: geniş yayılmasını, avtomobil-nəqliyyat, yaxud "impression" travma (döyülmə, dalaşma) ilə əlaqə; yay aylarında onların yüksək tezliklə, istirahət günləri, sutkanın axşam vaxtlarında baş verməsi. Kəllə-beyin travmalarının ən çox baş verdiyi risk qrupları – alkoqol intoksikasiyası vəziyyətində böyük yaşlı kişi əhalisidir. Yay dövründə KBT hallarının sayının mövsümi şəkildə artması nəzərə çarpır.

## Ədəbiyyat

1. Belyakov, V. D., Yafayev, R. Kh. (1989). Epidemiologiya. Moskva, 414 s.
2. Zuyeva, L. P., Yafayev, R. Kh. (2006). Epidemiologiya. Sankt-Peterburg: Foliant, 716 s.
3. Briko, N. I. (2013). Epidemiologiya (uchebnik). V 2 t., tom II. M.: OOO Izdatel'stvo «Meditsinskoye informatsionnoye agenstvo», 656 s.
4. Vtert, A. M., Chaklin, A. V. (1990). Epidemiologiya neinfektsionnykh zabolevaniy. M.: Meditsina, 272 s.
5. Pokrovskiy, V. I., Pak, S. G., Briko, N. I. (2006). Infektsionnyye bolezni i epidemiologiya. Moskva, 810 s.
6. Zuyeva, L. P., Yafayev, R. X. (2005). Epidemiologiya. Uchebnik. Sankt-Peterburg: OOO Foliant, 752 s.
7. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. (2012). Epidemiologiya (dərslik). Bakı, 728 s.
8. Bigkhol, R., Bonita, R., Kyel'strem, T. (1994). Osnovy epidemiologii. Zheneva: VOZ, 260 s.
9. Belyakov, V. D., Chaklin, A. V. (1986). Obshchiye printsipy i metodicheskiye osnovy epidemiologii neinfektsionnykh zabolevaniy. Trudy Akademii meditsinskikh nauk SSSR, s. 72-90.
10. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. (2020). Qeyri-infeksion xəstəliklərin epidemiologiyası (dərs vəsaiti). Bakı, 150 s.
11. Iskakov, Ye. B. (2017). Epidemiologiya serdechno-sosudistykh zabolevaniy.
12. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş., Vəkilov, V. N., Ağayeva, A. İ. (2022). Epidemiologiya: Milli rəhbərlik. Bakı, 915 s.

Göndərilib: 10.04.2024 Qəbul edilib: 04.06.2024

DOI: https://doi.org/10.36719/2663-4619/103/132-139

**Qorxmaz Hüseynov**
Naxçıvan Dövlət Universiteti
kimya üzrə fəlsəfə doktoru
huseynli72@list.ru
**Şəhriyar Camalzadə**
Naxçıvan Dövlət Universiteti
magistrant
camalzadsehriyar@gmail.com
**İsgəndər Mehdiyev**
Naxçıvan Dövlət Universiteti
mehdiyev56@mail.ru
**Rafiq Quliyev**
Təbii Ehtiyatlar İnstitutu
qraf1945@mail.ru
**Nazilə Mahmudova**
Təbii Ehtiyatlar İnstitutu
nazile.mahmudova.2017@mail.ru

# KİMYANIN TƏDRİSİ PROSESİNDƏ ŞAGİRDLƏRİN ELMİ-TƏDQİQAT FƏALİYYƏTİNİN TƏŞKİLİNİN XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Məqalədə kimyanın tədrisi prosesində şagirdlərin elmi-tədqiqat fəaliyyətinin təşkilinin xüsusiyyətləri araşdırılmış, eksperiment nəticəsində əldə edilmiş faktların təhlili, onların nəzəri izahı və ümumiləşdirilməsi aparılmışdır. Orta (tam) ümumtəhsil məktəblərinin baza səviyyəsində kimyanın öyrənilməsində qarşıda duran məqsədlər və kimyəvi tədqiqatın mahiyyətini anlamağa imkan verən müəyyən bacarıqların formalaşması yolları müəyyən edilmişdir. Müəyyən edilmişdir ki, kimya dərslərində tədqiqat işi vərdişlərinə yiyələnmək üçün əsas yük eksperimental tapşırığın, hesablama hissəsinin, elmi fərziyyənin və nəticələrin formalaşdırılmasından ibarət olan laboratoriya təcrübələrinə düşür. Kimyanın tədrisində istifadə olunan müxtəlif tədqiqat metodları sistemləşdirilmiş və şagirdlərin bilik və bacarıqlarının inkişafına kömək edən metodologiya hazırlanmışdır.

***Açar sözlər:*** *kimyəvi biliklər, elmi-tədqiqat fəaliyyəti, məqsədlər, nümayiş təcrübəsi, laboratoriya təcrübəsi, bacarıq*

**Gorkhmaz Huseynov**
Nakhchivan State University
Doctor of Philosophy in Chemistry
huseynli72@list.ru
**Shahriyar Jamalzade**
Nakhchivan State University
master student
camalzadsehriyar@gmail.com
**Isgandar Mehdiyev**
Nakhchivan State University
mehdiyev56@mail.ru
**Rafig Guliyev**
Institute of Natural Resources
qraf1945@mail.ru
**Nazila Mahmudova**

